# Qərbi Azərbaycanın Pəmbək Mahalı

(informativ araşdırmalar və tədqiqatlar illüstrativ...)



# Eminlər tayfasının Şəcərəsi

# ŞƏCƏRƏYƏ SAYĞI

Tarixi var şərəflidir, Eminsoyun şəcərəsi
Memarları ziyalıdır
Bunu bilir tanıyanın hər bir kəsi
Soykökümlə ünsiyyətdə ədəbli ol!..
Hikməti var qürurludur, soykökümün
Tarixini, sorağını hamı bilir
Zərbi, gücü dağı dəlir,
Şəcərəmin ardı gəlir...
Varlığından xəbər verir...

Söyləməyi vacib bildim...
Qulağında qalsın dedim...
Sadə sözlə nəql elədim.
Anlamasan mən nə edim...

Bil ki, bunlar gərək olar...
Ünsiyyətdə kömək olar.
Qocalıqla hünərini,
Ləyaqətlə şərəfini,
Səxavətlə çörəyini,
Etibarlı əməlini,
Namusu ilə güvənini,
Hamılıqla hər kəs bilir.

Qoy ki, bilsin bütün bunlar
Soykökümün qanı, geni
Sən bil onu
Dünya fani,
ruhun yaşar
Cismin hanı...
Anla bunu dedim yəni,
Qısacası, həyatının hər bir anı
Şəcərəmlə ünsiyyətdə,
ədəbinlə hörmətli ol!
Dinlədiyin sözlərimiz fərqi yoxdur,
Ya özümüz, ya sözümüz.
Müxtəsəri bilin bunu
Bu da sizə son sözümüz!..

*Müəllif*

# Qərbi Azərbaycanın Pəmbək Mahalı

*(informativ araşdırmalar və tədqiqatlar illüstrativ... )*



**Eminlər tayfasının**

**ŞƏCƏRƏSİ**

**Bakı – 2015**

**Əflatun Məmmədovun təşəbbüsü ilə Eminlər tayfasının veb saytı işlənib hazırlanmışdır. Daha ətraflı baxmaq üçün www.eminler.az.**

| | |
|---|---|
| **Kitabın ideya müəllifi və sponsoru:** | Əflatun Məsim oğlu Məmmədov |
| **Redaktə etdilər:** | Əflatun Məsim oğlu Məmmədov<br>Eldəniz Rüstəm oğlu Xocazadə |
| **Hazırladılar:** | Əflatun Məsim oğlu Məmmədov<br>Əli Cahangir oğlu Əhmədov<br>İsmixan Qəzənfər oğlu Musayev<br>Ayel Lütfiyar oğlu Məmmədov<br>Roman Əli oğlu Əhmədov<br>Qədim Şərif oğlu Əhmədov |
| **Dizayner:** | Eldəniz Rüstəm oğlu Xocazadə |







# Tərcümeyi-hal

Məmmədov Əflatun Məsim oğlu 01 may 1964-cü ildə Ermənistan SSR-in Quqark rayonunun Arçut kəndində anadan olmuş, 1981-ci ildə həmin məktəbi bitirərək, Azərbaycan Respublikası Ç.İldırım adına Politexnik İnstitutunun «Elektrotexnika» fakültəsinə daxil olmuşdur. 1986-cı ildə həmin institutun «Çoxkanallı Elektrik Rabitəsi» ixtisasını tamamlayaraq "Elektrik rabitə mühəndisi" tituluna yiyələnmişdir.

1986-ci ildə təyinatla Azərbaycan Respublikası Rabitə Nazirliyinin Rayon Rabitəsi İstehsalat Birliyinin Elmi-Tədris laboratoriyasında mühəndis vəzifəsində işə başlamış və daha sonra səmərəli fəaliyyətinə görə böyük mühəndis vəzifəsinə irəli çəkilmişdir.

1991-ci ildə istehsalatdan ayrılmamaqla Türkiyə Cümhuriyyətinin İstanbul şəhərində, Mərmərə Universitetinin Beynəlxalq Magistraturasına daxil olmuş və 1995-ci ildə «Sənaye mühəndisliyi» üzrə «Magistr» tituluna sahib olmuşdur.

Eyni zamanda, Mərmərə Universiteti Yabançı Dillər Eğitim, Öğrətim, Araşdırma və Uyqulama Mərkəzinin İngilis dilli üzrə tam kursunu müvəffəqiyyətlə bitirmişdir.

Ə.Məmmədov Türkiyə Cümhuriyyətində təhsilini davam etdirdiyi müddətdə Telekommunikasiya avadanlıqları istehsalçısı olan Kanadanın «NORTEL» şirkəti ilə Türkiyə Cümhuriyyətinin birgə təsis etdiyi «Netaş» firmasının Beynəlxalq Marketinq Departamentində mühəndis vəzifəsində də çalışmışdır.

Türkiyə Cümhuriyyətində təhsilini müvəfəqqiyyətlə başa vurduqdan sonra, 1996-1999-cu illərdə telekommunikasiya




sahəsində özəl sektorda müxtəlif rəhbər vəzifələrdə də çalışmışdır.

Ə.M.Məmmədov 1999-cu ildən Rabitə Nazirliyində rəhbər vəzifələrdə çalışır. Belə ki, 10 mart 1999-cu ildən 08 iyun 2001-ci iləcək Azərbaycan Respublikası Rabitə Nazirinin Texniki Məsələlər üzrə Müşaviri, 08 iyun 2001-ci il tarixdən Rabitə Nazirliyi Mərkəzi Aparatının Telekommunikasiya şöbəsinin müdiri, 10.01.2005-ci il tarixdən Rabitə və İnformasiya Texnologiyaları Nazirliyi Mərkəzi Aparatının Telekommunikasiya və İnformasiya Texnologiyaları şöbəsinin müdiri, 06.07.2006-cı il tarixdən isə Dövlət müəssisələrinin fəaliyyətinin əlaqələndirmə şöbəsində müdir vəzifələrində çalışmışdır.

Ə.Məmmədov hal-hazırda Dövlət Radiotezliklər İdarəsinin rəisi, o cümlədən "Kultura plus" İctimai Birliyinin sədri vəzifələrində çalışır.

Rus və ingilis dillərini bilir.

Dzüdo və Sambo üzrə idman ustalığına namizəddir.

Evlidir. İki oğul, bir qız atasıdır.



# ÖN SÖZ

*Ömür dedikləri sorsalar nədir?...*
*Xətləri qırışıq bir xəritədir!..*
**S.Vurğun**

Cənubi Qafqaz və Ön Asiya yaylasında çoxluq təşkil edən azərbaycanlılar dəfələrlə öz tarixi torpaqlarından kütləvi şəkildə köçürülməyə, deportasiyaya məruz qalmışlar. Bu hadisələr 1828-1832, 1877-1878, 1905-1907, 1918-1920, 1948-1953 və 1988-ci illərdə baş vermişdir.



Bu gün böyüməkdə və yetişməkdə olan gənc nəslin yaddaşının oyanması, dirçəlməsi, yeniləşməsi, habelə qədim dədə-baba yurdlarımızın unudulmaması, məişətimizin, adət-ənənələrimizin qorunması, böyük türk torpaqlarının bir parçası olan kəndimizdə yaşayan ulu türk tayfalarının, nəsillərin şəcərəsinin təşkili bizləri danılmaz faktlar və reallıqlarla üz-üzə qoyur.

Hər bir xalqın tarixi yaddaşı ictimai təkamül yolunu əks etdirən daş kitabələr, yazılı salnamələr, maddi və mənəvi mədəniyyət abidələridir. Bu sırada ayrı-ayrı yaşayış məntəqələrinə bağlı qədim və müasir tikililər, millətin soy şəcərəsi, toponimlər də xüsusi tarixi əhəmiyyət daşıyır. Çünki adı sadalanan mənbələr konkret zamanın məhsulu olmaqla yanaşı, həm də xalqın yurd, Vətən haqqında düşüncələrini əks etdirir, nəsillərarası varislik əlaqələrinin möhkəmləndirilməsinə xidmət edir. Odur ki, bu istiqamətdə görülən hər bir iş həcmindən və formasından asılı olmayaraq təqdirəlayiqdir. Bu günün hadisələri, fakt və problemləri sabahkı nəsildən ötrü tarix olduğunu hamımızın bildiyi üçün gələcəyə yaddaş nümunələri təqdim etməli, yazılacaq milli salnaməmizin əsasını təkmilləşdirmək üçün hər birimiz əlimizdən gələni əsirgəməməliyik. Çünki hər kiçik təşəbbüskarlıq nümunəsi milli yaddaş tariximiz üçün bir yonulu daş, kərpic məqamındadır. Yaradıcılıq nümunəsi olan bu material Ermənistandakı bir kəndin taleyinə həsr edilsə də, yurd həsrətindən doğulub, qədim Loru-Pəmbək mahalında millətimizin yaşayış, gün-güzəran qayğılarına işıq salır, nəhayət, indiki qürbətə çevrilən bu diyarın insanları haqqında ətraflı məlumat verir. O insanların ki, Vətəni

son mənzili hesab edir, yuxularında bu məkanı ziyarətə çıxır, ulularının ruhu dolaşan həmin müqəddəs yerləri doğma sayır. Nədənsə taleyinə qaçqınlıq acısından pay düşən qohum-əqrabalarımla görüşəndə, xüsusilə insani hiss və duyğuları yerindən oynadan toy və yas mərasimlərində onlarla rastlaşanda hüzn və kədərli səslə danışdıqlarının dəfələrlə şahidi oluram.

Müəlliflər, ermənilərin bizim xalqa qarşı törətdikləri zülmü, ədalətsizliyi, vəhşilikləri öz gözləri ilə görmüş ata-babalardan, yaşlı nəslin yaddaş söhbətlərindən eşitdiklərini qələmə almışdır.

Bizi özümüzə tanıdan, yaddaşımıza işıq salan, ruhumuza yaşamaq eşqi verən Vətən və vətəndaşlıq duyğusu ilə bağlı hər bir xatirə, hadisə, fakt, problem və s. milli tariximizi yaratmağa kömək edən başlıca amillərdir. Mövcud material da həmin vəzifənin dərkindən meydana çıxıb. Ümidvaram ki, bu materialın müəllifləri tayfanın qabaqcıl ziyalılarının tələbkarlığını, tənqid, təklif və şərhlərini də nəzərə alaraq gələcəkdə materialın yeni, daha təkmil variantı üzərində işləyəcək və həmçinin Loru-Pəmbək mahalı haqqında daha da təfərrüatlı tarixi məlumatların əldə olunmasında və gələcək nəslin qan yaddaşına yazılmasında əlindən gələni əsirgəməyəcəkdir. Bununla yanaşı, Eminlər nəslinin şəcərəsi tayfanın dünyasını dəyişən ağsaqqallarını, yaşlı nəslin nümayəndələrini yaxından tanıdacaq, o cümlədən yeniləşən gənc nəsil bir-biriləri ilə doğma qohumluq əlaqələrini qurmaqda və daha da möhkəmləndirməkdə əhəmiyyətli rol oynayacaq.



Bununla yanaşı, Eminlər tayfasının internetdə web səhifəsi hazırlanmış «www.eminlər.az» adı altında fəaliyyət göstərir. Daha ətraflı məlumat mübadiləsi üçün həmin web səhifədə mühüm əlaqələrin qurulması, o cümlədən, zəruri məlumatların əldə olunması və internet vasitəsilə ötürülməsi təşkil edilərək Web səhifədə yerləşdirilməsi də qarşıda duran başlıca vəzifələrdən biridir. Bu işdə hər kəsin aktiv iştirakına ehtiyac duyulur. Loru-Pəmbək mahalının tədqiqat materialları ilə yanaşı Eminlər tayfasının şəcərəsinə dair yazılmış kitab da bu web səhifəsində yerləşdirilmişdir. Bax: www.eminlər.az

Eyni zamanda, bu kitabın ərsəyə çatmasında əməyi olan hər kəsə öz dərin minnətdarlığımı bildirirəm.

**Məmmədov Əflatun Məsim oğlu**

# XIX əsrin əvvəllərində Pəmbək mahalının etnik tərkibi və ictimai-siyasi vəziyyəti*

*«Görüm Uriseti xaraba qalsın, Uriset gələndən bəri müsəlmanın işi düz gətirmir».*
**M.Cəlil «Mola Nəsrəddin» jur.**

Böyük Qarakilsə (Quqark) rayonu 1930-cu il sentyabrın 9-da yaradılıb. 1935-ci il yanvarın 3-nə qədər Böyük Qarakilsə rayonu, həmin tarixdən etibarən Kirovakan rayonu, sonra isə Quqark rayonu adlandırılıb. Hal-hazırda, məlum son 1988-89-cu illər deportasiyadan sonra Vanadzor adlandırılıb. Ərazisi 776 kv. km-dir.

Rayon mərkəzi Yaqublu (Meğrut) kəndidir (hazırda şəhər tipli qəsəbədir).

Rayon mərkəzinə ən yaxın dəmiryol dayanacağı 4 km kənarda yerləşən Böyük Qarakilsə (Kirovakan) stansiyasıdır.

Rayon mərkəzindən İrəvan şəhərinə olan məsafə 149 km-dir.

1970-ci ilin məlumatına görə: rayonun ərazisində 1 respublika tabeli şəhər, 1 şəhər tipli qəsəbə, 17 kənd soveti yaşayış məntəqələrinin ümumi sayı isə 28 olub; əhalisi (Böyük Qarakilsə şəhəri istisna olmaqla) 26,6 min nəfər təşkil edib, o cümlədən şəhər əhalisi – 0,5 min, kənd əhalisi – 26,1 min nəfər.

Pəmbək və Bazum dağ silsilələri arasındakı ərazini əhatə edir. Pəmbək dağ silsiləsi Gümrü şəhərindən Göyçə gölünün şimal-qərb hissəsinə qədər uzanır. Ən hündür zirvəsi 3101 m-dir. «Ermənistan SSR»-in rayonlaşdırılması zamanı ərazi əsasən Hamamlı və Böyük Qarakilsə rayonları arasında bölüşdürülmüşdür.

Bu yerlər tarixin müəyyən mərhələsində Borçalı xanlığına da daxil olub.

1801-ci ildə Azərbaycanın Pəmbək mahalı Rusiyaya qatıldı. Burada birinci Rus-İran müharibəsi (1804-13) başlananadək 950 imkanlı kəndli ailəsi qeydə alınmışdı. O zamanlar Azərbaycanda ümumi qəbul olunmuş qaydalara, yəni

* Material: «Pəmbək Mahalının Qursalı kəndi» Rəşid Namaz Vasif Sayadoğlunun araşdırmalarından götürülmüşdür.





əmlakına və tutduğu mövqeyinə əsasən hesablanmış olsaydı, onda bu təbəqə ümumi əhalinin 25%-i qədərini təşkil edərdi. Belə olan halda, yekun rəqəm 4200 ev təsərrüfatının olma ehtimalını yaradır. Bunu rusca yazılı arxiv sənədləri də sübut edir ki, Qafqazın müsəlman əyalətlərinin azı 60-70%-i, xüsusilə də hərbi əməliyyatların getdiyi yerlər rus hakimiyyət orqanlarının nəzərindən kənarda qala bilməzdi. Dediklərimizə istinad etsək, onda bu rəqəmin təqribən 4100 olduğu aydınlaşar. Tarixdən yaxşı məlumdur ki, hələ XVI-XVIII əsrlərdə Pəmbək (eləcə də digər Azərbaycan əyalətləri) əhalisi əsasən azəri (türklərdən – R.N.), həmçinin erməni və digər azlıqlardan ibarət idi. 1804-05-ci illər burada aparılan ilk kameral qeydəalma (fiskal siyahıyaalma) müəyyən etdi ki, Pəmbəkdə 2500 erməni (yaşayış məntəqəsinə 1303 nəfər hesabı ilə) qeydə alınmışdır.

Ancaq 1802-ci ildə Gürcüstan tərəfinin statistik (sənədlərində kəndlərin sayı 44 yazılır) tədqiqatlarında Pəmbək mahalı üzrə 32 kənd, o cümlədən 20 azərbaycanlı, 8 erməni və 4 qarışıq əhali yaşayan kənd olduğu göstərilir.

Kartli-Kaxetiyanın Rusiya tabeliyinə keçməsindən sonra Pəmbək və digər Azərbaycan əyalətlərində əhalinin daimi yerdəyişməsi prosesi başlayır. Miqrasiyaya əsas tələb isə Rusiya, İran və Türkiyənin hərbi-siyasi qarşıdurması, regionda maraqları idi. Məhz bu səbəbdən də, Pəmbək əhalisi-azərbaycanlılar İrəvan və Qarsa köçür, onların yerinə isə ermənilər gətirilirdi.



Qeyd edək ki, Pəmbək azərbaycanlılarının İrəvan xanlığında 1801-ci ildən kütləvi köçürülməsi ilə əsas demoqrafik dəyişikliklər başlayır. Həmin ildə 14 kənd (təqribən 5-6 min nəfər) xaricə köçməyə məcbur olmuşdu ki, onların da bir qismi tezliklə geri qayıtmışdı. Belə ki, pəmbəklilərin bir qismi Qars və Şörəyeldə (Ağbaba tərəflərdə) yerləşsələr də, ruslar 1805-ci ildə Şörəyeli tutduqdan sonra onlar da Qarsa qaçmağa məcbur olmuşdular.

1804-13-cü illərin müharibələri zamanı Pəmbək mahalı demək olar ki, boşalmışdı. Belə ki, əhalinin çox hissəsini İran ordusu cənuba tərəf qovmuş, yerdə qalanı isə doğma yurd-yuvalarını özləri tərk etmişdilər. Bu zaman rusların zəbt, azərbaycanlıların tərk etdikləri yerlərdə ermənilər məskunlaşdırılırdı. Pəmbəkli ağaların 1803-cü il yazılı məlumatlarından aydın olur ki, mahaldakı bütün ermənilər Qars, ya da başqa yerlərdən köçürülmədir. İran və Türkiyə ilə müharibələrdə ruslar İrəvan və Qarsdan çox sayda erməni çıxarmışdı. Belə ki, rusların İrəvana hücumu (1804-cü il) zamanı 357 erməni ailəsi Pəmbək və Gürcüstanın müxtəlif əyalətlərində yerləşdirilmişdi ki, onların da çox hissəsi sonralar Tiflisdə məskunlaşmışdılar. 1805-ci ildə Pəmbəkdə daha 40 irəvanlı erməni ailəsi kök saldı. 1807-ci ildə isə rusların Qarsa yürüşü dövründə 500 erməni ailəsi general Nesvetayev tərəfindən Pəmbəkdə yerləşdirildi. Bundan bir neçə il sonra (1810) mahala onlarca yunan və erməni-katolik ailəsi «pənah» gətirdi.

Tarixi mənbələr göstərir ki, artıq 1826-cı ildə Pəmbəkdəki 22 kəndin 20-sində ermənilər yaşayırdı. Beləliklə, 1801-25-ci illər ərzində Pəmbək və Şörəyeli tərk edən 6000 azərbaycanlı ailəsinin yerini kənardan gətirilən 1500 erməni ailəsi tutmuşdu. Nəticədə, bölgənin erməniləşməsi hesabına azərbaycanlı əhalinin







faiz nisbəti 27,5-ə enmişdi. 1826-cı ildə ruslarla ikinci müharibəyə başlayan İranın Pəmbək və Şörəyelə hücumu zamanı daha 300 azərbaycanlı bölgəni tərk edərək Türkiyə və s. yerlərə səpələnmişdi. 1829-cu il Andrianopol sülh müqaviləsi Rusiyaya hüquq verdi ki, Türkiyə xristianlarını öz hüdudlarına köçürsün. 1829-32-ci il siyahıyaalmasına görə, Türkiyə ermənilərinin bir hissəsi, daha dəqiq 10.988 nəfərdən ibarət 3292 ailə Pəmbək-Şörəyelə köçürüldü. Lakin, Köçürülmə Komitəsinin rəsmi məlumatına görə, oradan buraya 3512 ailə gəlib çıxdı. Bu fərq, həm də yerli əhalinin say göstrəicilərinin aşağı olmasının nəticəsi təkcə 1829-cu ildə taun xəstəliyindən ölənlər deyil, həm də 1829-30-cu il siyahıya alınması başlandığı vaxt onların çox hissəsinin qeydə alınmaması idi. Axı, 1832-ci ildə köçürülən əhalinin üçdə ikisindən çoxunu Türkiyədən köçürülənlər təşkil edirdi ki, onlar altı il müddətinə bütün dövlət vergilərindən azad edilmişdilər. Bu və ya başqa hallar 1831-32-ci illərdə kameral siyahıyaalmanı yoxlayan rus məmurlarını məcbur etmirdi ki, vergi verən əhalinin siyahısını dəqiqləşdirsin, hansı ki, əhali kənd starşinalarının maddi marağından qaça bilərdi. Məhz buna görə, siyahıyaalma yalnız 32000 nəfəri qeyd etdi. Hesablaşmalarımıza görə, 1829-32-ci illərin siyahıyaalınması və ondan sonrakı siyahıyaalma materialları ilə dürüstləşdirilməsi təsəvvür etməyə imkan verir ki, o halda əhalinin siyahıyaalmadan kənarda qalma dərəcəsi çox böyük idi, başqa sözlə, 10 hesaba alınmış adama 10 nəfər hesabaalınmamış düşürdü. Bütün etnik qruplar üzrə eyni siyahıyaalmadan kənarda qalanları nəzərə alaraq, 1832-ci il siyahıyaalınmasına görə, onlar arasındakı müqayisə dəyişdirilməmiş saxlanmışdır (bax cədvələ).

| Pəmbək mahalı | 1801 | | | 1826 | | |
|---|---|---|---|---|---|---|
| | Sayı | | | Sayı | | |
| | kənd | ailə | sakinlər | kənd | ailə | sakinlər |
| azərb. | 32-36 | 3588 | 21800 | 2 | 583 | 3498 |
| erməni | 8-12 | 612 | 3900 | 20 | 1360 | 8620 |
| **cəmi:** | 44 | 4200 | 25700 | 22 | 1943 | 12118 |

**P ə m b ə k –** Şörəyel bütünlüklə məskunlaşdırıldıqdan sonra ermənilər əhalinin böyük əksəriyyətini təşkil etdi ki, bu da ruslara Azərbaycanın bu iki şimal-qərb əyalətinin erməniləşdirilməsi siyasətinin müvəffəqiyyətlə başa çatdırıması üçün zəmin yaratdı.



# Bir başqa araşdırmalara görə:

BÖYÜK QARAKİLSƏ (Kirovakan-Vanadzor) – Bazum və Pəmbək silsilələrinin arasındakı çökəklikdə yerləşir. Pəmbək, Tnadzut və Vanadzoriket çaylarının qovuşağında yerləşir; 1924-cü ildən respublika tabeli şəhərdir; İrəvan şəhərindən 145 km məsafədədir; şəhərin içərisindən İrəvan-Tiflis dəmiryol xətti keçir (Böyük Qarakilsə stansiyası), 1980-cı ildə 149 min nəfər əhalisi olub.

Bir çox bölgələr kimi Loru-Pəmbək qəzası adlanan ərazi də qədim Azərbaycan torpağı olmuşdur. XVIII yüzilliyin ikinci yarısında rus imperiyasının yaratdığı bu qəza indiki Ermənistanın bir neçə rayonunu birləşdirirdi. 1842-ci ilədək Pəmbək qəzasına Böyük Qarakilsə (Kirovakan şəhəri, Yaqublu rayonu), Calaloğlu (Stepanavan) və Gümrü (Leninakan) qəzasının bir hissəsi və Hamamlı (Spitak) daxil idi. Əslində XIX yüzilliyin əvvəllərinədək bu ərazinin Ermənistan anlayışı ilə heç bir əlaqəsi olmayıb. Pəmbək ərazisinə daxil olan Böyük Qarakilsə (Yaqublu rayonu), Hamamlı, Calaloğlu rayonlarındakı türklər qədimdən burada yaşamış və mütləq əksəriyyət təşkil etmişlər. Rus-İran müharibəsindən sonra, 1828-ci ildə Təbriz yaxınlığındakı Türkmənçay kəndində bağlanan müqavilənin şərtlərinə görə qədim Azərbaycan torpaqları Araz çayı sərhəd olmaqla iki hissəyə parçalandı. Pəmbək qəzası rus imperiyasına verildi və o vaxtdan erməniləşdirmə siyasəti başladı.



1828-ci ilə kimi bu ərazidə bir nəfər də olsun erməni yox idi. Lakin, 1850-ci illərdə İrandan və Türkiyədən gələnlərin hesabına artıq ermənilər əhalinin 20-22 faizini təşkil etməyə başlamışdı.

Rus imperiyasının havadarlığı ilə 4 dəfə (1905, 1918-20, 1948-53, 1988-89) millətçi daşnak quldurları yerli əhaliyə qarşı dəhşətli cinayətlər törətmiş, onları doğma yurdlarından qovmuşlar. 1918-ci ildə qəzada yaşayan türklərin yarısından çoxu ev-eşiyindən qovularaq (Böyük Qarakilsənin əksəriyyəti) Axırkələyə, Qarsa, Ərdahana, Sarıqamışa, Qaraxanköyə köçməyə məcbur olmuşlar. 1918-ci ildə Andranikin quldur dəstələri Yaqublu rayonundakı Vartana kəndinin kişi əhalisinin əksəriyyətini iclas adı ilə məscidə toplayaraq diri-diri yandırmışlar.

1918-ci ilin mayında ingilis-türk müharibəsi başlayır. Türk ordusu geri çəkilməyə məcbur olur. Camaat öz doğma yurdlarına köçürülür və təhlükəsizliyə təminat verilir. Kimisi gəlir, kimisi də orada qalır.

1948-53-cü illərdə 150 mindən artıq azərbaycanlı, o cümlədən, qəzanın Heydərli, Yuxarı Kilsə, Molla Qışlaq kəndləri Muğan çölünə köçürülür, bu köçürülənlərin əksəriyyəti qızdırma və s. infeksiyalı xəstəliklərdən məhv olur.

Ermənistanın Yaqublu (Quqark) rayonunda azərbaycanlılara qarşı açıq-aşkar milli ayrıseçkilik siyasəti aparılırdı. Rayonda əhalinin 50-75 faizini azərbaycanlılar təşkil etdiyi halda rayon təşkilatlarının heç birində vəzifədə bir nəfər də azərbaycanlı işləmirdi. Rayon mərkəzində azərbaycanlıları adi peşə sahəsində işləməyə belə götürmürdülər. Hər addımbaşı türk şərəfi təhqir olunurdu.

Rayonda, hətta ermənilər yaşayan yerlərin, dağların, dərələrin, kəndlərin,

çayların adları türk mənşəli olub. Məsələn Quqark (Yaqublu) rayonunun Arçut (Ardıc) kəndində adlar tamamilə türk mənşəli idi. Çünki tarixdən burada başqa bir millətin yaşaması barədə ehtimal belə olmayıb. Eminin yalı, Sırxana, Nəcəfli, Araz yurdu, Todar, Əlləşən, Göycəli, Taxcalı, Çələvi, Dəlidağ, Kərəntökülən, Cənalların yurdu və s. Bu cür adlar göstərir ki, həmin yerlər əzəli Azərbaycan torpaqları olmuşdur.

Tarix boyu Böyük Qarakilsə şəhərinin söykəndiyi səfalı və meşəli dağın qədim adı Süleyman dağıdır. İndiki bu ad yalnız köhnə hərbi xəritələrdə saxlanılıb. Onu da deyək ki, Qarakilsə toponimi türk mənşəlidir. Rayonun Aşağı Kilsə və Yuxarı Kilsə kəndlərinin əhalisi təmiz Azəri türkləri olmuşlar. Elə üç «müəzzin» sözlərindən ibarət Eçmiədzin toponimi üç kilsə adlanırdı.



# Böyük Qarakilsə
# Yaqublu (Quqark) rayonu




**Pəmbək mahalı ərazisində rayon. Böyük Qarakilsə (Quqark) rayonu 1930-cu il sentyabrın 9-da yaradılıb.**

# ARÇUT KƏNDİ*

## (Tarixi coğrafiyası)

Rəvayətlərə görə, kəndin dörd tərəfində həmişəyaşıl ağaclara oxşayan ardıc ağacları bitərmiş. Kəndin adı da məhz bununla bağlıdır. Sonralar rayonda ermənilər sovxozla bağlı bütün sənədlərədə Ardıc sözünü qəsdən «Arçut» kimi yazmağa başlamışlar. Beləliklə də, «Ardıc» «Arçut»a çevrilmişdir. Ancaq bunun heç bir prinsipial fərqi olmamış. Çünki Arçut sözü də türk mənşəlidir. (Eyni zamanda ərəbcə «Arçut» sözünün lüğəti mənası «Ari-çut» çılpaq yer deməkdir).

Yaqublu (Quqark) rayonunun Arçut kəndi Ermənistanın şimalında, Bazum sıra dalğalarının cənub-şərq ətəyində yerləşir. Dörd tərəfdən azərbaycanlı kəndləri ilə əhatə olunmuşdur. Cənubdan Hamamlı rayonunun Saral kəndi, Cənub-Qərbdən Hamamlı rayonunun Qursalı kəndi, Şimaldan Bazum sıra dağları, Şərqdən isə Xancıqazla həmsərhəddir. Sahəsi 28,5 kv. km-dir. Kəndin ortasından axan Arçut çayı mənbəyini Bazum sıra dağlarından alır. Burada mineral su mənbələri, tuf inşaat daş yataqları vardır.

## Əhalisi:

Arçut xalis azərbaycanlı kəndidir. Dəqiq statistik məlumat ancaq 1831-ci ildən bəri verilmişdir. Lakin kənd ziyalılarının qeydlərinə əsasən, hələ XV-XVI əsrlərdə Arçutda indi də soy kökləri bəlli olan adamlar yaşamışdır. Təxminən kənd ziyalılarının qeydləri belədir ki, əhalinin ilkin sayı 35 nəfərə yaxın olmuşdur. Bunlar da kəndin 1988-ci ilə qədər yerləşdiyi yerdə yox, kəndin şimalında «Əlləşən» və «Sırxana» deyilən ərazilərdə yaşamışlar. Bu da onunla izah olunur ki, bura dağlıq zona olduğu üçün qışı çox sərt keçir, həm də uzun çəkirdi. Buna görə də yaşayış üçün yararsız sayılırdı. Kəndin camaatı əsasən qışda Şahalıya (Vahaqni kəndinə) və Sarımsaqlıya (Karaberd kəndinə. Şahalı və Sarımsaqlı türk kəndəri olmuşdur) köçür, yayda isə Arçuta qayıdırdı.

* Material: «Arçut kəndinə dair» V.Cavadoğlunun araşdırmalarından götürülmüşdür.





Lakin zaman keçdikcə Arçut kənd kimi formalaşmağa, əhalinin sayı artmağa başladı. XVII əsrin axırlarında kəndin əhalisi bir çox başqa yerlərdən köçənlərin (Azərbaycanın Qazax mahalından, Türkiyənin Qars vilayətindən və s.) hesabına 95 nəfərə çatmışdır. Kəndə sonuncu köç 1757-ci ildə Qazax mahalının II Şıxlı kəndindən olmuşdur. Bununla kəndin əhalisi 1850-ci ildə 150 nəfərə çatmışdır. Sonrakı dövrlərdə isə əhalinin sayı artaraq 1873-cü ildə 357 nəfər, 1886-cı ildə 447 nəfər, 1897-ci ildə 574 nəfər, 1914-cü ildə 759 nəfər, 1922-ci ildə 697 nəfər, 1926-cı ildə 820 nəfər, 1931-ci ildə 886 nəfər, 1939-cu ildə 1052 nəfər, 1959-cu ildə 1295 nəfər, 1970-ci ildə 2100 nəfər, 1979-cu ildə 2172 nəfər, nəhayət, 1988-ci ilin dekabrında 3349 nəfər olmuşdur. 1914-cü ildə əhalisi 759 nəfər olduğu halda, 1922-ci ildə əhalinin sayı 697 nəfərə enmişdir. 62 nəfər isə erməni quldurları tərəfindən öldürülmüşdür. 1918-20-ci illər erməni-azərbaycanlı müharibəsindən sonra kənd camaatı erməni vəhşiləri tərəfindən qovulmuşdur. Türkiyəyə üz tutan bir çox kənd sakini qaçarkən yolda erməni quldurları tərəfindən öldürülmüşlər.

Kənd strateji əhəmiyyətlidir. Buraya giriş ancaq Saraldan; Cənubdan və Cənubi-Qərbdən mümkün olduğu üçün düşməndən o qədər də qorxulu deyildir.



Bu kənddə VII, XII, XIV yüzilliklərə aid olan kənd xarabalıqları və oğuz qəbiristanlıqları var. Son illərdə aparılmış qazıntılar zamanı qəbirstan xarabalıqlarından daş kitabələrin tapılması sübut edir ki, bu kənddə Azərbaycan türk tayfaları yaşamışlar. Məsələn, kəndin köhnə qəbirstanlığından qəbir daşı üzərində «Məhəmməd-831» (əsgi oğuz əlifbası ilə) yazılmış sözləri əyani misal hesab etmək olar. Kənd məscidinin 1041-ci ildə tikilmə tarixi bəllidir. Qazıntılar zamanı tapılmış bir çox qədim əşyalar və onların üzərində həkk olunmuş sözlər bir daha sübut edir ki, bu kənddə ancaq türklər yaşayıb.

Bu kəndin tarixi həm də ona görə qədimdir ki, Azərbaycanın bir çox yerlərindən buraya gəlib yaşamaq istəyənlərin sayı hədsiz dərəcədə olmuşdur. Hətta Qarabağın müxtəlif yerlərindən Qaradolaqlılar (Qolgödəklilər) deyilən Qara Pirimin nəsli məhz bu kənddə məskunlaşmışdır. İndiki onlar kəndin yerli sakinləri sayılırlar. Onlar kəndə XVI əsrdə köçmüşlər.

Onu da qeyd etmək lazımdır ki, kəndin sosial tərkibi müxtəlif vaxtlarda əksərən Qazax mahalından köçənlərin hesabına təşkil edilmişdir. Qazaxın Fərəhli, Asdanbəyli, Cəfərli, I Şıxlı, II Şıxlı kəndlərindən köçərək burada məskunlaşmışdırlar. Bu köçlər də əsasən XV əsrdən başlayaraq XVII əsrin əvvəllərinə qədər davam etmişdir. Onu da demək lazımdır ki, kənd ta qədimdən yaşayış məskənidir. Odur ki, köçənlərdən başqa kəndin yerli sakinləri də olmuşdur.

Onu da qeyd etmək lazımdır ki, kəndin ərazisi zaman-zaman dəyişmişdir. Aşağıdakı faktlar bunu bir daha sübut edir.

Kəndin ərazisi, demək olar ki, başdan-başa tarixi abidələrlə zəngin olmuşdur. Ərazinin coğrafi relyefi insanların yaşaması üçün əlverişli olduğu üçün bu ərazi qədim zamanlardan yaşayış məskəni olmuşdur. Arxeoloji qazıntılar zamanı (bu qazıntı işləri məqsədyönlü olmamışdır, ancaq tikinti işləri aparılan za-







man üzə çıxmışdır) mədəniyyət abidələri, aşkara çıxmış yaşayış yerləri evlər, qəbirstanlıqlar, məişət əşyaları, əkinçilikdə istifadə olunan alətlər, müxtəlif cür silahlar, saxsı qablar, zinət əşyaları və s. onu göstərir ki, burada daimi insan yaşayışı olmuşdur.

Kənd seysmik zonada yerləşdiyindən və həm də zaman-zaman dağıdıcı müharibələrə məruz qaldığından kəndin yerləşdiyi yer bir neçə dəfə dəyişmişdir. Kəndin şimal-qərbində «Aydaşı» deyilən ərazidəki qədim qəbirstanlıqdan tapılmış qəbirlər və həmin qəbirlərdən götürülmüş müncuqlar, qolbağlar, daş baltalar, nizə ucluqları və s. əşyalar deməyə əsas verir ki, ibtidai-icma dövründə kəndin yerləşdiyi ərazi «Oyuğun dalı» adlanan yerdə olmuşdur.

Qaradolaqlı ocağının yerləşdiyi ərazidən tapılmış küp qəbirləri, saxsı qablar, gildən hazırlanmış müxtəlif məişət əşyaları göstərir ki, kəndin ərazisi xristianlığa qədərki dövrlərdə Cənub-Qərbdə «Qoltuq» deyilən yerdən tutmuş indiki Yerevan-Tbilisi magistralına qədər geniş bir ərazini əhatə etmişdir. Buradakı toponimlər də sübut edir ki, həmin ərazidə türk tayfaları yaşamış və oturaq həyat keçirmişlər. «Böyük Nalbənd» təpəsi, «Kiçik Nalbənd» təpəsi toponimləri burada kənd təsərrüfatının maldarlıq və əkinçilik kimi sahələrinin də geniş inkişaf etdiyini göstərir.



Onu da qeyd etmək yerinə düşərdi ki, qazıntı işi aparılan vaxtı erməni millətindən olan alimlər də böyük maraqla bura gəlmişlər. Buradakı kilsə, onun üzərindəki xaç və daş kitabə ilə tanışlıqdan sonra həmin daş kitabənin sındırılmasını təkid etmişlər və hətta erməni kilsəsi ilə heç bir əlaqəsi olmadığını, qeyd etmişlər. Bu böyük qəbirstanlığın oğuzlara aid olduğunu söyləmişlər. Oğuzların isə türklərlə (red: - Azəri Türklərlə) heç bir əlaqəsi olmadığını təkidlə bildirmişlər. 1988-ci ildə zəlzələdən sonra kəndin şimal-şərqində «Əlləşən» deyilən ərazidən yaşayış yeri kimi ev damları aşkara çıxmışdır. Aydın olmuşdur ki, dağ aşınması zamanı həmin evlər torpağın altında qalmışdır. Eyni zamanda, oradan türk tarixi mədəniyyətinə aid mədəni abidələr tapılmışdır.

Onu da qeyd etmək lazımdır ki, kəndin ərazisi «Dədə Qorqudla» səsləşən adlarla zəngindir: «Qara Çoban» (Qaraca Çoban), «Araz Yurdu», «Xal-Xal Yurd», «Hənifətoyolan» və s. buradan aydın olur ki, Arçut kəndinin çox qədim tarixi vardır.

Təəssüfləndirici faktdır ki, bu vaxta qədər nə keçmiş SSRİ, nə də Azərbaycan mətbuatında erməni quldurlarının rayondakı vəhşiliklərinə dair bir yazı da getməyib. Bəlli olduğu kimi, azərbaycanlılara qarşı aparılan soyqırımı siyasətində 1988-ci il erməni quldurları üçün son mərhələ oldu. Azəri türkləri Rus imperiyasının himayədarlığı sayəsində rayondan vəhşicəsinə, silah gücünə tamamilə qovuldular.

Lakin təbiət erməni quldurlarının həyasızlığına dözmədi. 1988-ci il dekabrın 7-də bir çox rayonlar, o cümlədən, Quqark (Yaqublu) rayonu zəlzələdən darmadağın oldu. Minlərlə erməni ilə bərabər təbii fəlakətdən Quqarkda (Yaqubluda) 33 azərbaycanlı da həlak oldu. Arçut kəndindən isə bir körpə uşaq zəlzələnin qurbanına çevrildi.

Bu hadisədən sonra rayon sahibsiz qaldı. Təhlükə getdikcə artırdı. Özünü







qorumaq üçün hər yerdən əli üzülən Arçut camaatı çoxlu əzab-əziyyətlərə məruz qaldı, bir neçə nəfər erməni quldurları tərəfindən vəhşicəsinə öldürüldü, evlər dağıdıldı. Azərbaycanla bütün rabitə əlaqələri kəsildi. Lakin buna baxmayaraq kənd sakinləri öz peşəkarlıq məharətindən istifadə edərək Bakı şəhəri ilə müntəzəm əlaqə saxlayır, kəndin bütün problemlərini Bakıya çatdırırdılar.

1988-ci il dekabr ayının sonuna qədər bütün kənd kütləvi şəkildə köçürüldü. İndiki Arçut camaatı pərakəndə şəkildə respublikanın ayrı-ayrı yerlərinə səpələnib.








# KƏNDİN SOSİAL TƏRKİBİ

**(tayfalar)**

Tarixin ağır sınaqlarına həmişə mərdliklə sinə gərən Arçut kənd camaatı əsrlər boyu saysız-hesabsız təbii fəlakətlərə, müharibələrə, qarşıdurmalara məruz qalmışdır. 1905 və 1918-20-ci illər erməni-azərbaycanlı müharibəsi, 30-cu illərdə erməni daşnaklarının riyakarlığı nəticəsində neçə-neçə soydaşımızın repressiyaya məruz qalması, 1948-53-cü illərdə erməni-azərbaycanlı qarşıdurmasının yenidən güclənməsi və 1988-89-cu illərdə Ermənistandan vəhşicəsinə, camaatımızın silah gücünə kütləvi şəkildə ata-baba yurdlarından didərgin salınması belə ağrılı faktlardandır. XIX yüzilliyin əvvəllərindən başlayaraq Ermənistandan qovulan 2,5 milyondan artıq azəri türkünün arasında arçutlular da var. Dörd min nəfər kənd sakini indi Azərbaycanın, Rusiyanın, digər keçmiş SSRİ respublikalarının müxtəlif yerlərinə səpələnmişdir.

Kəndin sosial tərkibini tayfalar təşkil edir. Buna görə də tayfalar haqqında ayrı-ayrılıqda məlumatlar verməyi qərara aldıq. Yeri gəlmişkən, xatırladaq ki, ayrı-ayrı tayfalar olduğuna baxmayaraq əhali zaman-zaman bir-birinə qaynayıb qarışmış, mehriban bir ailə yaratmışdılar.

Son 350-400 il əvvəl kənddə yaşayan irili-xırdalı qohumluqlara malik tayfalar adlandırdığımız kök qohumlarını göstərən tayfaların şəcərə cədvəlini və onlar haqqında gəlib çatmış dəqiq məlumatlar verməklə kəndin tarixini müəyyənləşdirmək mümkün olmuşdur. Və araşdırmalardan məlum olmuşdur ki, Arçut kəndi haqqında dəqiq məlumat XVI əsrin sonu, XVII əsrin əvvəllərinə təsadüf edir.

Kəndin sosial tərkibini aşağıdakı Azəri türk tayfaları təşkil edir.

1. *Eminlər*
2. *Fərəhlilər (Canallar, Baləmmədlilər, Namaz evləri)*
3. *Koxallar*
4. *Qaradolaqlılar (Qolgödəklilər; Qarabağlılar,*






*Qara Pirimin nəsli*
*Türk tayfası)*

5. *Cır-Cırlar (Cilovdarlılar; Məşədi Həsənlilər, Həlleylər, Əhmədlilər)*
6. *Çəltiklər*
7. *Layışlar (Lahıclar)*
8. *Dəllər*
9. *Hacallar (Əmiraslanovlar, Məsimovlar, Məmmədlər)*
10. *Qocallar*
11. *Göydodaqlılar*
12. *Rəfilər ailəsi*
13. *Qazılar*
14. *Gəlmələr və s.*



Bir neçə kəlmə də Pəmbək toponimi barədə. Quqarq(k) və Hamamlı rayonlarının ərazisi orta əsrlərdən Pəmbək mahalı adlanır. Yuxarıda qeyd edildiyi kimi, Pəmbək toponimin mənası bu günədək aydınlaşdırılmayıb. Lakin Aparan (Ələyəz) mahalında 1831-ci ilədək Pəmbək adlı kənd və dağ olmuşdur.

Arçutun bir yaşayış məntəqəsi kimi yaşı çox qədimdir. Tarixçilər sübut ediblər ki, e.a. VIII-VII əsrlərdə ermənilər hələ Kiçik Asiyada (Anadoluda) məskunlaşdıqları vaxt türklərin ulu əcdadları indiki Ermənistan ərazisində yaşayırdılar. Odur ki, ermənilər hazırkı Ermənistan torpaqlarına gəlmə olduqları üçün burada erməni dilində toponimlərdən söhbət gedə bilməzdi. Əvvəlki əsrlər bir yana, hətta XIX əsrdə əhalisi bütünlüklə ermənilərdən ibarət olan kəndlərin, eləcə də ermənilərlə azərbaycanlıların (türklərin) qarışıq yaşadıqları neçə-neçə kəndlərin adları da türk mənşəli idi. Əgər onların adlarını xatırlasaq, bu uzun siyahı və çox vaxtla müşayiət olunar. Ağbulaq (Lusaxpyur, 1946), Avdıbəy (Tsaxkaşen, 1939; Tsaxkaberd, 1967); Bekənd (Mets Parni, 1967), Qaçağan (Lernavan, 1946; Arevadzoğ, 1978), Qaral (Katnacur, 1946), Qaltaxçı (Berdavan, 1946; Hartagyuğ, 1978), Qızılörən (Şenavan, 1946; Aşotk, 1990), Qaraboya (Xnkoyan, 1946), Dərəköy (Sarigyuğ, 1946), Əfəndi (Bozkənd; Karadzor, 1946), Keşişkənd (Geğarot, 1935), Göy Yoxuş (Saralanç, 1946), Güllücə (Sarahart, 1950), Göyərən (Qoqaran, 1946), Mollaqışlaq (Güllüdərə, 1978), Nalbənd (Şırakamut, 1978), Muncuqlu (Silkar, 1946), Tapanlı (Geğasar, 1978), Çiydəməl



(Arevaşoğ, 1978), Çotur (Sarameç, 1946), Hortnoy (Craşen, 1940) və s.

**Haşiyə:** XVI əsrə aid edilən «Kitabi Diyarbəkriyyə» tarixi əsərində göstərilir ki, Ağqoyunlu hökmdarı Uzun Həsən saray alimlərinə öz nəsil şəcərəsinin öyrənilməsini əmr edir. 60 nəfərədək alim Uzun Həsənin şəcərəsinin tədqiqinə cəlb edilir. Məlum olur ki, Uzun Həsənin 55-ci babası Oğuz xana gedib çıxır. Alimlər onu da öyrəniblər ki, Oğuz xan Göyçə gölü ətrafında dəfn edilib.

«Kitabi Diyarbəkriyyə»də əks olunan məqam onu sübut edir ki, hazırda erməni əsarətində olan Göyçə ərazisində hələ eramızdan əvvəlki illərdə də türklər yaşayıblar. Bu fakt bəzi əcnəbi alimlərin türklərin bu torpaqlara XI əsrlərdən sonra gəlmələrilə bağlı mülahizələrini alt-üst edir.

## YADDAŞ



Yəqin ki, nəsillərdən söhbət açarkən tez-tez şəcərə, nəsil, tayfa, qəbilə, sülalə və s. kimi sözlərdən istifadə edəcəksiniz. Onların yerini təyinatı üzrə işlətmək üçün həmin sözlərin hərfi mənasını və ya açılışını yadınıza salmaq istərdim.

*1. Nəsil – qan qohumluğuna əsaslanan insan qrupu, birlik. Nəsil çox vaxt ümumi əcdadın adı ilə adlanır.*

*2. Qəbilə – qəbilənin əsas əlaməti isə,ekzoqamiyadır... Yəni «müəyyən kollektiv və ya qohum üzvlər arasında nigah münasibətlərini qadağan edən adət» deməkdir.*

*3. Tayfa – insanların qəbilədən böyük olan birliyidir. Tayfa üzvləri qan qohumluğu ilə bir-birinə bağlı olur və bir neçə qəbiləyə bölünür.*

*4. Şəcərə (ərəbcə – ağac) – nəsil ağacı. Nəslin mənşəyini və qohumluq dərəcəsini müəyyənləşdirir. Bir neçə sülalə, xanədan və s. bütün nəsil qollarını göstərən siyahıdır.*

*5. Sülalə (ər.) – ... eyni bir nəsildən olan deməkdir.*

*6. Xanədan – farsca yer, məkan; latınca əlaqə, münasibət deməkdir.*

# PƏMBƏK MAHALI
## 1889-cu ildə




**(Uzunluq verst, hündürlük isə futla)**
**topoqraf S.Kurakin**


AZƏRBAYCAN XANLIQLARI 18-ci ƏSRİN İKİNCİ YARISINDA
18-ci əsrin ikinci yarısında Azərbaycan sərhədləri
Xanlıqların və sultanlıqların sərhədləri
Xanlıqların mərkəzləri
Qalalar
Şəhərlər
Ticarət və karvan yolları
Dəniz ticarəti yolları
Keçidlər
Suraxanı ateşgədəsi
Qubalı Fətəli xanın (1758 - 1789) birləşdiyi ərazi
1751-ci ildə Məhəmməd Həsən xan Qacarın Qarabağa yürüşü
1752-ci ildə II İraklinin Gəncəyə yürüşü
1756-cı ildə Salyan sultanlığının Quba xanlığı tərəfindən zəbt edilməsi
1757-ci ildə Fətəli xan Əfşarın Şuşaya yürüşü
1759-cu ildə Qubalı Fətəli xanın Dərbəndə yürüşü
1767-ci ildə Qubalı Fətəli xanın Şamaxıya yürüşü
1767-ci ildə Şəkili Hüseyn xanın Şamaxıya yürüşü
18-ci əsrin 60-cı illərində Kərim xan Zəndin yürüşü
1781-ci ildə Qubalı Fətəli xanın Qarabağa yürüşü
1784-cü ildə Qubalı Fətəli xanın Ərdəbilə yürüşü
18-ci əsrin 80-ci illərində Ağa Məhəmməd xan Qacarın yürüşü
1795-ci ildə Ağa Məhəmməd xan Qacarın I-ci yürüşü
1797-ci ildə Ağa Məhəmməd xan Qacarın II-ci yürüşü
1796-cı ildə V.A.Zubovun komandanlığı altında rus qoşunlarının yürüşü
1796-cı ildə rus qoşunlarının qayıtdıqları yol
XƏZƏR DƏNİZİ
DAĞISTAN
GÜRCÜSTAN
OSMANLI İMPERİYASI
DƏRBƏND
DƏRBƏND XANLIĞI
TABASARAN
Balakən
CAR-BALAKƏN CAMAATLIĞI
Car
İLİSU SULTANLIĞI
İlisu
Gələsən-Görəsən
ŞƏKİ
ŞƏKİ XANLIĞI
TİFLİS
QAZAX
QAZAX SULTANLIĞI
ŞƏMSƏDDİL SULTANLIĞI
Şəmkur
GƏNCƏ
GƏNCƏ XANLIĞI
Mingəçevir
Ağdaş
Bərdə
İRƏVAN
İRƏVAN XANLIĞI
Göyçə g.
Eçmiədzin
QUBA
QUBA XANLIĞI
Xudat
Niyazabad
Şabran
Rustov
Gülüstan
Ağsu
ŞAMAXI
ŞAMAXI XANLIĞI
BAKI XANLIĞI
BAKI
CAVAD
CAVAD XANLIĞI
QARABAĞ
Ağdam
Əsgəran
ŞUŞA
QARABAĞ XANLIĞI
SALYAN
SALYAN SULTANLIĞI
TALIŞ XANLIĞI
Ərkivan
LƏNKƏRAN
Astara
NAXÇIVAN XANLIĞI
NAXÇIVAN
Əlincə
Culfa
Ordubad
MAKU
MAKU XANLIĞI
XOY XANLIĞI
Cars
XOY
QARADAĞ XANLIĞI
ƏHƏR
Əhər
Mişkin
ƏRDƏBİL
ƏRDƏBİL XANLIĞI
Salmas
Mərənd
TƏBRİZ XANLIĞI
TƏBRİZ
Sarab
Deyxarqan
Urmiya g.
URMİYA
URMİYA XANLIĞI
Türkmankəndi
Miana
MARAĞA
Soucbulaq
Zəncan
Qızılüzən
Ənzəli
REŞT
GİLAN XANLIĞI
Kür
Araz


AZƏRBAYCAN
16-cı ƏSRDƏ
QARA DƏNİZ
Osmanlı
ARALIQ DƏNİZİ
Təbriz
XƏZƏR DƏNİZİ
ŞEYBANİLƏR DÖVLƏTİ
SƏFƏVİLƏR DÖVLƏTİ
İran körfəzi
Səfəvilər dövlətinin sərhədi
Səfəvilər dövləti yarandığı dövrdə onun ərazisi (1501-1502)
XVI əsrin birinci yarısında Səfəvi-Osmanlı müharibələri dövründə Osmanlı imperiyasının işğal etdiyi ərazi
1555-ci ilədək Səfəvilər dövlətinin paytaxtı
Qalalar
Şəhərlər
Keçidlər
1590-cı il İstanbul sülhünə görə Osmanlı-Səfəvi torpaqlarının təxmini
Ən böyük inzibati vahidlərin - bəylərbəyliklərin sərhədləri
1555-ci ildə Səfəvilər dövlətinin sərhədləri (vassal ərazilər daxil olmaqla)
I İsmayılın qoşunlarının hərəkəti:
Ərdəbildən Ərzincana (1499-1500-cü illər)
Ərzincandan Təbrizə (1500-1501-ci illər)
Təhmasibin qoşunlarının Şirvana və Şəkiyə hərəkəti
1514, 1578, 1585-ci illərdə Osmanlı qoşunlarının Şirvana və Şəkiyə hərəkətinin istiqamətləri
1538
Böyük xalq üsyanlarının yayıldığı ərazilər
1578
Vuruşmaların yerləri və illəri
Krım tatarlarının hərəkətinin ümumi istiqaməti (1578-1581-ci illər)
OSMANLI İMPERİYASI
KAXETİ
KARTLİ
DAĞISTAN
Dərbənd
Niyazabad
Xaçmaz
Quba
Şabran
ŞİRVAN
Tiflis
(Qanıx)
(Qabırrı)
(Kür)
(Samur)
Gələsən-Görəsən
Qax
Kiş
Şəki
ŞƏKİ
Lori
Qazax
Şəmkür
Gəncə
Lahic
Qaləybuğurt
Gülüstan
Şamaxı
Ərəş
Qəbələ
Surxab
Gürcivan
Ağdaş
1500
1578
ÇUXURSƏD
GƏNCƏ (QARABAĞ)
Bərdə
Tərtər
Zərdab
Ağdam
Cavad
Beyləqan
Bakı
XƏZƏR
DƏNİZİ
Mahmudabad
İrəvan
Dəbil
(Araz)
(Göyçə g.)
QARABAĞ
ŞİRVAN BƏYLƏRBƏYİLİYİ
ÇUXURSƏD BƏYLƏRBƏYİLİYİ
1514; 1585
BƏYLƏRBƏYİLİYİ
Qafan
Varsan
MUĞAN
1537-1538
Salyan
Bəcirəvan
Maku
Naxçıvan
1501
Əlincə
Bərzənd
QARADAĞ
Çaldıran
1514
Culfa
Ordubad
Lənkəran
TALIŞ
Zunuz
(Əhər)
1538
Əhər
(Qarasu)
1580-1581
Xoy
Mərənd
Təsuc
Astara
Salmas
TƏBRİZ
Xiov
Ərdəbil
Sarab
1571-1573
Ucan
Dehxarqan
Türkmankəndi
Urmiya
(Urmiya g.)
Xalxal
GİLAN
Mianə
Marağa
Rəşt
Uşnu
Kağızkünan
Zəncan
(Qızılüzən)
(Səfidrud)
Lahican
BƏYLƏRBƏYİLİYİ
Sainqala

**ŞİMALİ AZƏRBAYCANIN ÇAR RUSİYASI TƏRƏFİNDƏN İŞĞALI**

Qalalar
Şəhərlər
Keçidlər

Rus qoşunlarının əsas qüvvələrinin hərəkət istiqaməti
Rus hərbi donanmasının hərəkət istiqaməti
Rus qoşun dəstələrinin hərəkət istiqaməti
1809 Azərbaycan xanlıqlarının Rusiyaya birləşdirilməsi illəri
18-ci əsrdə Azərbaycanın sərhədləri
Xanlıqların və sultanlıqların sərhədləri

XƏZƏR DƏNİZİ
GÜRCÜSTAN
DAĞISTAN
İRAN
TİFLİS
Car
Balakən
İLİSU SULTANLIĞI
1803-04
İLİSU
ŞƏKİ
ŞƏKİ XANLIĞI
1805
QUBA XANLIĞI
QUBA
1806
Şirvan
Qudyal
Alazan
Xram
İori
QAZAX
QAZAX-ŞƏMSƏDDİL SULTANLIĞI
1801
Şəmkir
GƏNCƏ
GƏNCƏ XANLIĞI
1804
Ərəş
Ağdaş
Göyçay
Ağsu
ŞAMAXI
ŞAMAXI XANLIĞI
1805
Bərdə
BAKI XANLIĞI
1806
BAKI
Göyçə g.
İRƏVAN XANLIĞI
QARABAĞ XANLIĞI
Ağdam
ŞUŞA
1805
Kür
Araz
Həkəri
Salyan
NAXÇIVAN XANLIĞI
1828
NAXÇIVAN
Ordubad
TALIŞ XANLIĞI
1809
LƏNKƏRAN
Astara

# PƏMBƏK MAHALI




Pəmbək və Bazum dağ silsilələri arasındakı ərazini əhatə edir.Pəmbək şəhərindən Göycə gölünün şimal-qərb hissəsinə qədər uzanır.Ən hündür zirvəsi 3101m-dir.Ermenistan SSR-nin rayonlaşdırması zamanı ərazi əsasən Hamamlı və Böyük Qarakilsə rayonları arasında bölüşdürülmüşdür.Bu yerler tarixin müəyyən mərhələsində Borcalı Xanlığına daxil olub.





# EMİNLƏR TAYFASININ ŞƏCƏRƏSİ ÜZRƏ ÜMUMİ STATİSTİK GÖSTƏRİCİLƏR

| Sıra | Göstəricilər | Nəfər | Kişi sayı (nəfər) | Qadın sayı (nəfər) | Qeyd |
|---|---|---|---|---|---|
| **1** | **Tayfanın ümumi sayı** | **682** | **352** | **330** | |
| – | Dünyasını dəyişənlər | | 92 | 51 | |
| **2** | **Ali təhsillinin sayı** | **105** | **81** | **24** | |
| – | Həkim | | 9 | 3 | |
| – | Mühəndis | | 17 | 1 | |
| – | Müəllim | | 16 | 17 | |
| – | Hərbçi | | 4 | – | |
| – | Polis | | 2 | – | |
| – | Hüquqşünas | | 3 | 1 | |
| – | İş adamları | | 20 | 2 | |







## Ulu tanrının yaratdığı müqəddəs varlıq
# İNSAN!

Əsrlər dəyişir, zamanlar keçir,
Sən isə öz yerində qalırsan dünya.
İnsanlar yaranır, insanlar köçür,
Özün öz nizamını qurubsan dünya.

Hər mahalda söylənirdi adları,
Duz-çörəkli ad qoymuşdu babalar.
Eminlər tayfasının fəxri idi,
Emin soylu adlı-sanlı ağalar.

Sevindirir yaxınını, yadını,
Qeyrətlidir həm kişisi, qadını.
Yaşadırlar tayfamızın adını,
Mərd igidlər, ər oğullar, ərənlər.

Aydın Rza sizlərə ömür diləyir,
Babaların ad-sanına baş əyir.
Nə qədər ki, bu dünyada yaşayır,
Tayfama yazılacaq neçə-neçə dastanlar.





# EMİNLƏR TAYFASININ TARİXİ BARƏDƏ ÜMUMİ MƏLUMAT

Eminlər tayfasının tarixini araşdırıb aramaq, bu tayfa haqqında geniş və dolğun məlumatlar toplamaq heç də bizə asan başa gəlməmişdir. Bunun üçün bir neçə ağsaqqallarımızın, ağbirçəklərimizin və kəndimizin yaşlı nəslindən eşitdiklərimizi bir yerə toplayaraq və dəqiqləşdirərək qələmə almağı qərara aldıq. Bütün bunları qələmə almaqda məqsədimiz gələcək nəslə öz soylarının, köklərinin haradan qaynaqlandığını göstərmək və bu nəslin adını daima uca tutmaq, eyni bir nəsildən olan insanlara qohumluq əlaqələrini unutmamaq və özündən sonrakı nəsillərə ötürməkdir.



Bəzi insanlar elə düşünürlər ki, tayfanın, soyun, kökün haradan qaynaqlandığını öyrənmək, ulu babalarının necə və harada yaşadıqarını bilmək heç də vacib deyil. Amma onu da xatırlatmaq istəyirəm ki, belə düşünən insanlar bu fikirlərində yanılırlar. Çünki soyunu, kökünü bilməyən insan heç bir zaman gələcəyə sağlam fikir, sağlam düşüncəylə baxa bilməz.

Bir neçə yaşlı nəslin nümayəndələrinin söylədiklərinə əsaslanaraq, «Eminlər» tayfası Türkiyə Cümhuriyyətinin Qars mahalının Çamırlı kəndində yaşamış «Emin» adlı şəxsin adı ilə bağlıdır.

Tarixdən də məlum olduğu kimi, XVII-XVIII əsrlərdə Qars mahalı Osmanlı-Səfəvi qarşıdurmalarında təkrar-təkrar əldən-ələ keçmişdir (bax: xatirələr əlavə olunur). Bu fakt onu göstərir ki, «Eminlər» tayfasının da ilk dəfə köç edib gəldiyi torpaqlar yuxarıda qeyd olunduğu kimi ağır müharibələr sonrası əhalinin düşdüyü ağır vəziyyət və bu vəziyyətdən çıxış yolu kimi nisbətən daha sakit və dinc yerlərə, o cümlədən dağlıq ərazilərə, yəni bu gün məskunlaşdıqları Qarakilsə mahalının Ardıc kəndinə gəlmələri versiyası məntiqi əsas kimi götürülə bilər. Tayfanın soy-kökünün dəqiq mənsubiyyəti və mövcud faktların, o cümlədən, xalq arasında söylənənlərin araşdırılmasının vacibliyi baxımından bu məsələyə ciddi yanaşılmışdır. Bununla əlaqədar, başqa bir mənbədən aldığımız məlumatı işıqlandırmaq da yerinə düşərdi. Belə ki, tayfanın hərbi polkovniki (yeri gəlmişkən, Əli Cahangir oğlu Əhmədov Sovet dövründə bu rütbəni almışdır) Moskvadan şəxsi işləri araşdırıldığı zamanı onun İran keçmişli olduğu iddia edilmişdir. Bu fakt onu deməyə əsas verir ki, Osmanlı-Səfəvi qarşıdurmaları zamanı Qars vilayəti gah səfəvilərin, gah da ki, Osmanlının nəzarətində olmuşdur.

Emin kişinin 5 oğul övladlarından ikisi – İbrahim və Məmməd (ləqəbi Məmlidir) anaları ilə birlikdə Pəmbək mahalının Heydərli kəndinə, sonra Saral kəndinə və nəhayət oradan da Arçut kəndinə gəlmiş, məskunlaşaraq elə bu-







rada evlənmişlər və dünyalarını da burada dəyişmişlər. Bu əhvalat təqribən hicri təqvimi ilə 1020-ci illərə təsadüf edir. Miladi tarixi ilə hesablanarsa bu tarix təqribən 1650-1660-cı illəri əhatə etdiyi güman edilər. Məntiqlə düşünülərsə həqiqətdə nəsildən-nəsilə keçid ili təqribən 25-30 il hesablanır. Belə ki, mən şəxsimdə təklif edirəm bir faktı qeyd etmək istəyirəm. Atamın atası Yusif kişi ilə atamın arasında doğum illərinin fərqi 37 ildir. Babamın doğum tarixi 1900-cu il, atamın isə 1937-ci ildir. Atam babamın dördüncü övladıdır. Yəni birinci övladının (Sənuvər mamamın) yaşı o zaman 23-25 idi. Beləliklə, 7-8 nəslin dəyişiminin tarixi hesablandıqda 7-8 x 30 ilə = 250 ilə yaxındır. Onu da qeyd etmək lazımdır ki, İbrahimlə Məmməd Arçut kəndinə gələndə artıq bu kənddə məskunlaşmış bir neçə köklü tayfalar yaşayırmış. Onların əksəriyyəti Qazax mahalının Şıxlı kəndindən olub. Hətta deyilənlərə görə, Arçut kəndinin ilk sakinlərindən olmuş Rəfi ağa da Qazax mahalından köçüb gəlmişdir. Eyni zamanda, «Eminlər» tayfasının əsasını qoymuş qardaşlardan – İbrahim kişi Rəfi ağanın qızını almış, ondan da iki övladı – Emin (İbrahim öz atasının adını qoyub) və Nəbi olmuşdur.

Məmməd müəllimin qeydləri:

## UNUDULMAZ XATİRƏLƏR VƏ FAKTLAR, RƏQƏMLƏR

Qeyd: Məlumatlar Məmməd Məmmədovun «Xatırla məni» kitabçasından götürülmüşdür.

### İbrahim Eminoğlu tayfasının tarixi
### Balaxanım nənənin dedikləri

Balaxanım nənənin 102 yaşı vardı. Rəcəb kişinin nəvəsi Balaxanım nənə söyləyirdi:

- Atam Rəcəb İbrahim oğlu bilikli, dünya görüşü geniş, hərtərəfli bir kişi idi. Təhsil almamasına baxmayaraq, şifahi xalq ədədbiyyatını dərindən bilirdi. Kəndin adamları uzun qış gecələrində onun evinə toplaşardı. Atam xalq nağıllarından, dastanlardan, şəriət qanunlarından onlara danışar, söhbət edərdi. Kəndə bir aşıq gələndə ondan icazə alardı. Atam yas və toy mərasimlərində ağsaqqallıq edərdi. Rəcəb kişi otları yaxşı tanıyırdı. Türkəçarədən istifadə edərdi (daha ətraflı bax: əlavə 2).

### Rəcəb kişinin dedikləri

Rəcəb kişi qızı Balaxanıma belə nəql etmişdi ki, bizim tayfanın soy kökü dünya görmüş İbrahimdən rəvayət kimi başlanır. İbrahimin atasının adı Emin olub. İran-Türk müharibəsində Qars mahalında aclıq baş verir. Buna görə də əhali Çamırlı kəndindən köçürlər İrəvan mahalına. Hazırda Çamırlı kəndi Türkiyə Cümhuriyyətinin Qars mahalının ərazisində yerləşir.

1918-ci ildə əhalinin çoxu Pəmbək mahalının Ardıc kəndindən köçüb başqa







yerlərə gedib. Ardıc kəndi elliklə Qars mahalına getmişdi. Atatürk və Lenin arasında aparılan danışıqlara və bağlanılan müqaviləyə əsasən hər kəs öz kəndinə, məmləkətinə qayıtmalı idi. Bizim kəndin əksəriyyəti geri qayıtmışdı. Yalnız Göyüşlü tayfasından olan Mustafa, Qolugödəkli tayfasından Türkiyədə qalıb yaşayanlar var. Hazırda qohumlardan gəlib-gedənləri hələ də var.

İrəvan mahalı o zaman İranın daxilində ayrıca xanlıq idi. İbrahim orada çox yaşaya bilmir. O, oradan köçərək Pəmbək mahalına gəlir.

Rəcəb kişi qızı Balaxanıma belə bir rəvayət eləyibdi ki, qış ayları imiş. İbrahimin bir anası, bir qardaşı, bir də öküzü varmış. Ev əşyalarını öküzə yükləyib yola düşüblər. Onlar Alagəz dağından aşıb, Ley dağına keçib oradan da Hallavar dərəsinə enirlər. Daha sonra isə Heydərəli deyilən yerə qədər gəlib çıxırlar. Yolda çox məşəqqətli günlər keçirirlər borana-çovğuna düşürlər.

Anası, qardaşı və ev əşyaları yüklü öküz də boran-qarda dözə bilməyib ölürlər. O zamanlar Heydərəlidə bir neçə yeraltı daxmalar varmış. İbrahim orada yaza qədər qalıb özündən kiçik qalan Məmili qardaşları ilə yaşayır. Sonra isə oradan havalar ayazıyanda Ardıc kəndinə gəlib çıxır. Bu illər bir qəbir daşında yazılan tarixə əsasən hicri tarixi ilə 1020-ci il imiş.

İbrahim Ardıc kəndində Rəfi ağaya nökər olur. Rəfi ağa varlı-hallı imkana sahib olub, var-dövləti aşıb-daşırmış. İbrahim orada qalıb onlara çoban işləyir.



Rəcəb kişi bunları qızına danışırmış. Mən bunları həm Balaxanım nənədən, həm də Məmmədən, Balaməmmədəli tayfasından olan 120 yaşlı Əsəd kişidən, Koryusublu deyilən tayfadan olan Əbdürrəhman kişidən eşitmişəm.

Rəfi ağanın bir neçə qız züryəti varmış. Böyük qızı başqa bir tayfanın oğluna nişanlı imiş. Xalq arasında dedi-qodu varmış ki, guya İbrahim Rəfi ağanın nişanlı qızını sevir. Rəfi ağa söz-söhbətin doğru olub-olmamasını bilmək üçün sınağa əl atır. O, evdə deyir ki, qonşu kəndə gedirəm. Ancaq o, bir yerdə gizlənib görsənmir. Gecə hamı yatır. Səhərə yaxın İbrahim qalxıb naxırı çölə aparmaq istəyir. Görür ki, qızların üstü açıqdır. Üzünü yana çevirib onların üstlərini örtür və çıxıb naxıra gedir. Rəfi ağa görür və əmin olur ki, dedi-qodular, camaatın sözləri bir şayədir. İbrahimin bu işdən (Rəfi ağanın ona qurulmuş sınağından) heç xəbəri də olmur.

Rəfi ağanın arvadı qızının nökər İbrahimi sevməsinə görə narahat olur. Nişanlı qızın nökəri sevməsi onun xoşuna gəlmir və o, İbrahimə tələ qurur ki, onu öldürtsün, ya da elə eləsin ki, o, çıxıb getsin.

Rəfi ağanın arvadı xörəyə ağı zəhər, qatır, qızına tapşırır ki, mən çayın kənarına paltar yumağa gedirəm, İbrahim malı-naxırı gətirəndə bu yeməyi onun qabağına qoyarsan yeyər.

Anası qıza tapşırıq verikdən sonra çıxıb gedir. İbrahim çöldən gec gəlir, buna görə qız xörəyi öz qabağına qoyaraq yeyir. Qız azara düşür, onu qurtara bilmirlər. Qız ölüm çağında İbrahimi istəyir. İbrahim gəlir. Qız ona deyir ki, bu sənin üçün qurulmuş tələ idi, mənə qismət odu, sən bu qapıdan çıx get.

Qız bu sözləri dedikdən sonra dünyasını dəyişir. Qızı kəndin ortasında dəfn edirlər. Həmin baş daşı son vaxtlara qədər dururdu. Onun üstündən qızın ölüm tarixi, adı həkk olunmuşdu (bu hicri tarixi ilə 1020-ci ilə təsadüf edir).






## Bədircahan xanım
## 1020 (Hicri)

İbrahimin Ardıca gəlmə tarixi və məskunlaşması aydın olur. İbrahim Rəfi ağanın qapısından gedir. Qonşuluqdakı Saral deyilən kəndə köçür.

Bir neçə il orada qalandan sonra bir yaz günü Ardıca qayıdır. Rəfi ağanın evinin ətrafında kalaflıq varmış. Oranı gicitkan otu basıbmış. İbrahim bu yeri təmizləyir ki, orada daxma tikib yaşasın. Onun xarabalıqda işlədiyini görən Rəfi ağa yanına gedib soruşur ki, sən burada neyləmək istəyirsən?

O da cavab verir ki, özümə kümə düzəltmək istəyirəm.

Buna görə burada çalışıram.

Rəfi ağa ona kömək etməyə başlayır. Daxma hazır olur. Rəfi ağa sonralar onun düzlüyünə-təmizliyinə görə qızının birini ona ərə verir.

İbrahim ailə qurub bu daxmada yaşayır. Vaxt olur ki, onun bir oğlu olur. Oğunun adını atasının adıyla Emin çağırır.

İllər keçdikdən sonra zəhmətkeşliyi hesabına İbrahim varlanır, adlı-sanlı olur.

Çox keçmir ki, İbrahimin arvadı Bədircahan xanım dünyasını dəyişir (1020 hici tarixi ilə). Onun birinci arvadından iki oğlu Emin və Nəbi dünyaya gəlib. İbrahimin aldığı ikinci arvadı Qazaxdan idi.

Rəcəb kişinin dediyinə görə, İbrahimin ikinci arvadının Məhəmməd (Çeçen Məhəmmədin oğlu) adlı bir ögey oğlu varmış.

Ardıc kəndində bir neçə nəsil formalaşır. Başqa yerlərdən köçüb gələnlər ayrı-ayrı məhəllələr saldıqları zaman o yer hansı yerdən gəlmişdilərsə o yerin adıyla adlandırıblar. Məsələn, Fərəhli, Layışlar, Çəltiklər, Qolugödəkli, Dəllər, Tat Rəfilər, Çolaqlar və s.

İbrahimin adı ilə ondan sonrakı nəsil İbrahimli adlanıb.

Çar Rusiyası hakimiyyətə gələndən sonra Qaraisə mərkəz idi, adını dəyişdirib Qarakilsə qoydular. Rus qoşunları burada saxlanılırdı. Ona görə də Qaraisədə ruslar üçün bir kilsə tikirlər ki, öz dillərində dua etsinlər. Sovet qurulandan sonra da rayonun adı o cür adlanıb.

1936-cı ildən sonra isə bu rayon Kirovun adını alır.

Son günlərə qədər bu adla adlanıb.

Pəmbək mahalı qədimdən türk torpağı olub, ancaq tarixi hadisələr elə gətirib ki, rus imperiyasının köməyi ilə bizim dədə-baba torpaqlarımızda ermənilər özlərinə dövlət yaradıblar.

Oğuzların yaşadığı torpaqlara indiki haylar-ermənilər sahib çıxıb. Tarixi ədalətsizlik hələ də davam edir.

Yuxarıdakı Məmməd müəllimin qeydlərindən göründüyü kimi İbrahimin həyat yoldaşının adı (Rəfi ağanın qızı) Bədircahan xanım olub. Məlumatı İbrahimin adını daşıyan və bu günə kimi qorunub saxlanılan tayfa qəbirstanlığında sarı qəbir daşının üstündə ərəbcə yazı təsdiqləyir (bax: Şəcərədə İbrahim kişinin adına kənd qəbirstanlığı illüstrasiya).







Emin İbrahim oğlu adlı-sanlı, hündürboylu bir adam idi. Onun həddindən artıq varlı-hallı olduğu, o cümlədən qoyun sürüsü, mal naxırı, at ilxısı, torpaq sahələri, dükanı, bağı-basatı və s. var imiş. Emin Pəmbək mahalında Qarakilsə (Qaraisə) xanlığı kəndləri üzrə kəndxuda vəzifəsində işləmişdir. Nikolay tərəfindən medalla (o zaman ona «talqa» deyərlərmiş) mükafatlandırılmışdır. Erməni, rus, gürcü millətlərdən yaxın dostları olub.

Deyilənlərə görə, o, çox səxavətli, insaflı imiş. Belə ki, öz çobanlarına, naxırçılarına, «nökər-naib»lərinə, əkin sahəsində işləyən kəndçiləri ilə çox yaxşı rəftar edərmiş və əmək haqqlarını artıqlaması ilə ödəyirmiş. Qapısında işləyən adamlara «nökər» kimi yox, öz övladı kimi yanaşırmış. Sonralardan kəndin müxtəlif yerlərinə onun adına toponimlər, adlar qoyulub. Məsələn: Eminin yalı, Eminin bulağı, Eminin dərəsi və s kimi adlar var idi.

Eminlə Nəbinin anası gənc yaşlarında bilinməyən səbəblərdən dünyasını dəyişdiyindən, İbrahim Rəfi ağanın məsləhəti ilə Qazax mahalının Şıxlı kəndindən, mərhum arvadının qohumlarının köməkliyi ilə ikinci dəfə evlənir. İbrahim qeyd edildiyi kimi, bir oğlan uşağı olan dul qadınla evləndikdən sonra uşağı və qadını da götürüb Arçut kəndinə qayıdır. Bu uşağın adı Məmməd (ləqəbi çeçen Məmməd) idi. Məmməd Arçuta gələndə onun təxminən 5-6 yaşında olduğu söylənilir.



Məmmədin atası Şimali Qafqaz millətlərindən, deyilənlərə görə, çeçen millətindən olub, sənəti isə qalayçı olub.

Qalayçı kəndlərə gedəndə arvad uşaqlarını da aparırmış. Bu dəfə Qazax mahalına gələndə yenə ailəsi ilə gəlir. Sənəti ilə əlaqədar işlədiyi dövrlərdə Qazaxa yaxın olan kəndlərə, o cümlədən Gürcüstanın yaxın kəndlərinə gedərmiş, 2-3 gün çalışdıqdan sonra yenə də Şıxlıya ailəsinin yanına qayıdarmış. Bir dəfə elə olur ki, qalayçı yenə iş dalınca ətraf kəndlərə sonuncu dəfə gedir və geri ailəsinin yanına qayıtmır. Deyilənə görə, başına səbəbi məlum olmayan hadisələr gəlir...

Bu səbəbdən arvad dul qaldığına görə İbrahim kişiylə ikinci dəfə ərə getməyə razılıq verir. Məmməd (çeçen Məmməd) İbrahimin yanında onun himayəsində böyüyür. Daha sonra ailə qurur və bununla da Məmməd öyü tayfasının ilk təməli qoyulur.

İbrahim evləndikdən sonra həmin qadından olan ikinci oğul övladının adını Rəcəb qoyur. Rəcəb kişi Emin və Nəbi ilə ata bir ana ayrı, çeçen Məmmədlə isə ana bir ata ayrı qardaş sayılıblar.

İbrahim kişinin qardaşı Məmmədin (Məmilinin) 2 övladı olub. Oğlu Abdulla, qızının adı isə Reyvə olub.

Məmməd (Məmili) qardaşı İbrahim kimi varlı, dövlətli bir kişi olur. Deyilənə görə, həmişə hara getsə, çuxasının altında kəmərlə belinə bağlanmış çoxlu qızıl pullar gəzdirirmiş və bu barədə qohum-əqrəbanın məlumatı var imiş.

Günlərin bir günü Məmməd (Məmili) kişi saçını düzəltdirmək məqsədi ilə, qardaşı İbrahimin oğulluğu Məmmədin (çeçen Məmmədin) yanına gedir. Çünki, söylənənlərə görə, Məmmədin (çeçenin) əlindən dəlləklik sənəti gəlirmiş. Çeçen Məmməd əmisi Məmilinin üzərində dəlləklik edən zaman (bu



hal dəfələrə baş verib) görür ki, əmisinin üstündə çoxlu qızıl pullar var. Bunu da yəqin ki, daha əvvəllər də bir neçə dəfə görübmüş və fürsətdən istifadə edərək, (bu vəziyyətə məntiqlə yanaşılsa) əvvəlcədən düşünülmüş planını həyata keçirmək məqsədilə əlində olan ülgüclə əmisini qətlə yetirir və meyidini də öydamında (o vaxt tövlə elə adlanırmış) gizlədir.

Məlum səbəbə görə axşam Məmili evə gəlmir. Onun harada olduğunu, o cümlədən qardaşı evində olub-olmamasını barədə maraqlananda da, çeçen Məmməd deyir ki, mən əmimin üz-başını qırxdıqdan sonra o, aftafanı götürüb çaya tərəf getdi...

Həmin gündən etibarən Məmli yoxa çıxır, axtarışlar davam edir, lakin tapılmır ki, tapılmır, onun nə ölüsündən, nədə ki, dirisindən xəbər çıxmır. Bu əhvalatdan sonra kənddə hamının ağzına söz olub, kimi axtarırmışlar, axtarılan adamı tapana kimi deyərlərmişlər ki, Məmili kimi yenə «aftafasını götürüb yoxa çıxdı» və ya «Məmili qeybə çəkilən kimi yoxa çıxıb»...

Tayfanın ağsaqqalları, o cümlədən kənd camaatı 1980-ci illərin ortalarına kimi bu fikirdə olurlar ki, Məmili doğrudan da «qeybə» çıxıb.

1980-85-ci illərdə çeçen Məmmədin nəticəsi Sayad, köhnə damlarını uçurub yerində yeni evlər inşa edən zaman iri skeletli insan sümükləri aşkar olunur. Sümüklərin böyüklüyünə görə (Məmili ucaboylu adam olubmuş) məsələ (mətləb) məntiqlə aydın olur ki, Məmili «qeybə» çıxmayıbmış, böyük ehtimalla çeçen Məmməd onu öldürdükdən sonra öydamının arxasında tövlədə basdıraraq gizlədibmiş.



O zamanlar guya Məmili «qeybə» çıxandan sonra kənddə söz-söhbət yaranıb ki, Məmməd «öyünün» tövləsində «cin» peyda olub. Atları gecə minərək səhərə qədər çapırmış və səhər tezdən gedib görürlərmiş ki, atlar həqiqətən «tərləyib», həmdə hürkmüş kimi özlərini qəribə aparırlar. Bu məsələni eşidənlər tövləyə gedib-gəlməkdən çəkinirlər və qorxu xofu yaranır. Eyni zamanda belə düşünürlər ki, elə Məmilini də yəqin ki «cinlər» oğurlayıb. Aydındır ki, bu «uydurmaların» hamısını çeçen Məmməd qurur ki, tövləyə az adam gəlib-getsin və qətlə yetirdiyi atalığının qardaşı Məmilinin ora basdırıldığından heç kim xəbər tuta bilməsin...

Məsələyə bir azda aydınlıq gətirərək görünür ki, o, bunu necə edirmiş? Yəqin ki, tövləyə gecələr gəlirmiş, atları durmadan hürküdürmüş və sonra onların üzərinə su səpir və səhər hamıya haray çəkirmiş, hətta, atları bayıra çıxardıb əyani göstərirmiş ki, atları guya gecə «cinlər» həqiqətən minib «tərlədib». Bu səbəbdən də Məmilinin tövləyə basdırılmağı heç kimin ağlına gəlməmiş və heç kimə (məlum hadisə baş verənə kimi), yəni iri skeletli insan sümükləri aşkar olunana kimi, məlum olmayıb. Bu günə qədər də el içində danışırlar ki, Məmməd öyünün damında, hətta dərə yuxarısında olan komunda belə «cinlər» yaşayırlarmış. Son zamanlara qədər el arasında yayılan bu kimi uydurmalar adamlarda qorxu xofu yaradaraq haqqında danışılırdı.

Nəticədə, Eminlər tayfasının törəmələri yuxarıda qeyd olunanlardan aydın olur ki, iki qardaşın davamçılarıdır. Yəni, İbrahimin və Məmmədin (Məmilinin) övladlarıdır. Arçut kəndində yaşayan camaat bu səbəbdən də İbrahimin





törəmələrinə «Eminlər», Məmmədin törəmələrinə isə «Məmililər» deyərdilər. Çoxları elə bilirdilər ki, bu tayfalar ayrı-ayrı tayfalardır və hətta tayfanın cavanları belə bilmirdi ki, bunlar eyni, yəni bir tayfaya mənsubdurlar.

«Eminlər» tayfasının sonrakı tarixi barəsində geniş məlumat, eyni zamanda şəcərə ilə yaxından tanışlıq və izahlı-illüstrativ materiallar bütün qaranlıq məqamlara aydınlıq gətirəcəkdir.









## Eminlər tayfasının soy-kökünə dair əldə edilən rəvayətlərdən Eminov Alı Məmməd oğlunun xatirələri:

**1-ci xatirə:** Atası Qara Məmmədin evlənməsi haqqında belə rəvayət söyləyirdi: Atam çoban imiş, atası Eminin qoyun sürülərinin baş çobanı imiş. O, həmişə dağlarda yurd yeri salıb, məskən eylərmiş. O, yaz olanda yaylağa köçərmiş. 30 yaşa çatıbmış, amma hələ evlənməyibmiş. Gürcüstanın Qara-çöp deyilən vilayəti həmişə Ermənistanın Çubuqlu yaylaqlarına dağa köçüb gəlirlərmiş (o zaman Ermənistan olmamışdır. O yerlər Çar Rusiyasının ixtiyarında omluşdur). Çobanlar yaylaqlardan bir yerə toplaşar, yarışlar (güləşərlərmiş, at çaparlarmış, qumar (kart) oynayarlarmış və s.) keçirərlərmiş. Məmməd kişi həm yaxşı güləşər, həm də yaxşı kart oynayarmış. Güləşdə onun kürəyini yerə vuran olmamışdır. Anam Fatmanın qardaşı da o yayalaqlara gəlirmiş. Atam Məmməd anamı qumarda udub. Sonralar el adəti ilə atası Emin kişi gəlini köçürüb gətiribdir. Fatma nənənin tayfası hazırda Gürcüstanın Qaraçöp kəndində yaşayır.

**2-ci xatirə:** O, el çobanı imiş. Cəynalıların qoyun sürüsünə Çəltiyin Məmmədi adlı bir cavan oğlan ilə birgə çobanlıq edirmiş. Payız günü imiş, el yaylaqdan arana köçübmüş. Bunlar sürünü yurdlara otarmağa aparırlar. Bir dəstə atlı bunları yaxalayıb tuturlar. Hər ikisini arxa-arxaya bağlayıb güllə ilə vurmaq istəyirlər. Neçə dəfə tüfəngin tətiyini çəkirlər, amma güllə açılmır. Qaçaqmalçılar Gürcüstanın Bolnisi rayonunun Kəpənəkçi kədindən imişlər. Bunlar əllərini bir təhər açırlar və kəndə xəbər gətirirlər. Camaat hökumətdən adam götürüb sürünün izi ilə gedib Gürcüstanın Kəpənəkçi kəndindən sürünü tapırlar. İş-işdən keçibmiş – qaçaqmalçılar heyvanları qəssabxanaya veriblərmiş. Pulun yarısını alıb geri qayıdırlar.



**3-cü xatirə:** Çar Rusiyası Tbilisi şəhərindən Yerevana dəmir yolu xətti çəkdirirdi. Bu xəttin çəkilişində onun keçdiyi kəndlər biyar edilmişdi. Xəttin çəkilişində işləyənlərin əksəriyyəti iranlı və yerevanlılar idi. Emin ağa dəmir yolunun kənarında yatmaq üçün qazarmalar və alver üçün dükanlar açmışdı. Alı Məmməd oğlu söyləyirdi ki, kəndlə oranın arası 2 km idi. O, əmisi oğlu Şərifə oraya dükandan təndir çörəyi, ayran, qatıq, şor, pendir və qaymağı ulaxlarla aparır və geri qayıdırmışlar. Həmin yerlərin xarabalıqları qaçqınlıq vaxtına kimi qalırdı.

## Əli Cahangir oğlu Əhmədovun Eminlər tayfasının tarixinə dair əlavə qeydləri

Türkiyənin Qars mahalının Çamırlı kəndində yaşayan Emin kişinin beş oğul övladı olub: Nəbi, Yusif, Mustafa, İbrahim və Məmməd (Məmili). Emin kişi çox varlı-hallı adam olub. Varlı adam olmağı ilə yanaşı həm də vəzifə sahibi olub. O, Qars mahalının o vaxtkı dövlət qurumlarında işləyirmiş və onun (dövlət) mahal talxası da (möhürü) var imiş.

Rəvayət olunur ki, Emin kişi öləndən sonra övladları arasında onun var-dövlətini bölüşdürərkən böyük narazılıqlar olub. Məcbur olublar ki, biri-birilərindən ayrılar və bu səbəbdən hətta başqa dövlətlərin ərazilərinə köçüblər.

Dosye: 1) Mən 1975-ci ildə Hərbi Akademiyaya qəbul olan vaxtı SSRI (KQB) təhlükəsizlik orqanları tərəfindən əcdadlarımın kimliyi yoxlanılıb və onların təhqiqatına görə İrandan gəlmə kimi qeyd olunmuşlar. Mən sonradan tarixçilərdən və ağsaqqallardan öyrəndim ki, Qars mahalı nə vaxtsa İran dövlətinin tabeliyinidə olub.

2) Bəzi məlumatlara görə isə, Emin kişinin oğulları arasında narazılıq baş verəndən sonra İbrahim, Məmməd və anaları İrana köçüblər. Mənim tərcümeyimdə İrana qədər təhqiqat aparılıb.

İbrahim, Məmməd (Məmili) və anaları Qars mahalından ayrılarkən, atalarının talxasını də özləri ilə aparıblar. Çünki, İbrahimin oğlu Eminin də Pəmbək mahalında talxası olub (Məmməd müəllimin təhqiqatında bu barədə, yəni Eminin talxası barədə, söhbət gedir).

Bəzi məlumatlara görə, Emin kişi Qars mahalına Şimali Qafqazdan köçüb gəlibmiş. Ona görə Qarsda ona ləzgi Emin deyirlərmiş (ləqəbi). Bu o demək deyil ki, o, ləzgi millətindən olub, o vaxtar Şimali Qafqazda yaşayanlara ləzgi deyirdilər. Məsələn, Sovetlər vaxtında ukraynılara, belaruslara rus kimi müraciət edirdilər.

Ali Dənizçilər Məktəbinin rəisi, hal-hazırda Hindistanda hərbi attaşe olan tarix elmlər doktoru polkovnik Nurulla Əliyevin (əslən o, Dağıtsandan idi, amma Göyçay rayonunda yaşayır – babası 18-ci əsrdə gəlib) təhqiqatında da həqiqətən Emin adlı-sanlı adam olduğu, lakin onun ləqəbi aşıq Emin olduğu qeyd olunurdu. Onunla söhbət edərkən, mənim ona verdiyim məlumatları o təhlil edərək uzalşdırdı ki, aşıq Emin elə sizin babanız olub.

Eminin Qars mahalına Şimali Qafqazdan köçüb getməsi Qazıyev Yusifin təhqiqatlarında da öz əksini tapmışdır.

Məsim müəllim demək olar ki, Arçut kənd orta məktəbində dərs hissə müdürü işlədiyi dövrdə bütün müəllimlərin dərslərində oturmuş, dinləmiş və vəzifə funksiyası ilə əlaqədar dərs prosesinin hansı şəkildə getməsini yaxından izləmişdir. Eyni zamanda iştirak etdiyi bütün dərs prosesləri haqqında öz fikirlərini və onun açıq dərs şəklində qeydiyyatını yazılı şəkildə aparmışdır.

Bunlardan mərhum Məmmədov Məmməd Alı oğlu və Məmmədov Xatalı Alı oğlunun dərslərində aparıdığı açıq dərs qeydiyyatları onun xatirəsinə töhvə olaraq kitaba salmışıq (bax: əlavələr).

Onu da qeyd edək ki, Məmmədov Məmməd Alı oğlu və Məmmədov Xatalı Alı oğlu hər ikisi də Məsim müəllimin doğma əmisi oğlanlarıdır. Lakin, aparılan dərs qeydlərini diqqətlə təhlil etsək görərik ki, Məsim müəllim bu şəxslərlə yaxın qohumluq əlaqələrinə baxmayaraq, etdiyi təhlillər onu göstərir ki, qiymətləndirməni tam obyektiv aparmışdır. Bununla da Məsim müəllimin işdə onunla çiyin-çiyinə çalışan bütün həmkarlarına, məsləkdaşlarına eyni gözlə baxmağı, heç kimə fərq qoymamağı bu yazılarda da öz əksini tapmışdır.

Yumor hissi ilə Xatalı müəllimə söylədiyi fikirlər heç unudulmur. Belə ki, Xatalı müəllim bədən tərbiyəsi müəllimi olduğu üçün ona həmişə özünün nümunəvi olmasını tələb edərdi. Bir dəfə xatırlayıram ki, Xatalı müəllim bədən tərbiyəsi müəllimi olmasına baxmayaraq, idmançı formasında olmayıb. Təsəvvür edin ki, qış günü şaxtalı hava şəraitində şagirdlər idman formasıda olduğu halda Xatalı müəllim paltoda və şarfa bərk-bərk sarınmış vəziyyətdə idman dərslərini aparardı. Yəni, həm artıq çəki, həm də idman formasını geyinmədiyini görən Məsim müəllim ona zarafatla deyinərdi: «Səndən şagirdlər baxıb nə götürsün» və gülüşərdilər.

***Müəllif***



## Nəbi kişi haqqında

Nəbi kişi tayfanın ən hündürboylu, təmiz və səliqəli geyimli və gözəl xarici görünüşə malik bir nurani ağsaqqal kimi tanınıb. Onun yaxşı mahnılar oxuduğunu (xanəndəliyi) söylənilirmiş. Hətta onu öz kəndimizdən başqa yaxın ətraf kəndlərə də məclislərə dəvət edirlərmiş. Onun adına Arçut kəndində müxtəlif yer adları da mövcud olub. Bunlardan «Nəbinin gözəsi», «Nəbinin bulağı» və s. kimi yer adlarını misal göstərmək olar. Eminlə Nəbi ata-ana bir doğma qardaş olmalarına baxmayaraq, Eminin Rəcəblə (Eminlə Rəcəb ata bir ana ayrı qardaş olub) münasibətləri daha yaxın olub. Deyilənə görə, ona heç bir ata payı verilməyib. Nəbi kişi onlardan (yəni qardaşlarından) aralı Məşədilər deyilən tayfanın yaşadığı tərəfdə məskunlaşmışdır. O zaman kəndin o səmti istifadəsiz boş torpaqlar olub. Məşədilər tayfası da bu torpaqlara sonradan gəlmələr olub. Hətta Mustafa Əhməd oğlunun yaşadığı ərazi də Nəbi kişiyə aid olub. Mustafa kişiyə həmin ərazini sonradan Nəbi kişinin oğlu – Cabbar kişi bağışlayıb. Bunun səbəbi söylənilənlərə görə Əhməd – oğlu Mustafanı yola vermirmiş və tez-tez onu evdən qovarmış. Mustafa kişini qovanda həmişə əmisi Cabbar kişinin evinə gedərmiş. Bu hadisələrin tez-tez təkrarlandığını görən Cabbar kişi öz əmisi nəvəsi Mustafaya deyib ki, sən nə vaxta kimi mənim qoltuğumda qalacaqsan və Mustafa kişinin kənddəki yaşadığı ərazini Cabbar Nəbi oğluna verib. Bu ərazidə o vaxtar (Əzimin Məhəmmədi və Dalyanlardan başqa) heç kim yaşamırmış. Zaman-zaman Sovetlər birliyində Nəbi kişinin ona məxsus olan torpaqları, yəni bu gün Mustafa kişiyə verdiyi torpaqları, başqa tayfalardan olan kənd sakinlərinə pay torpaqları kimi veriblər.



Hətta onu da demək yerinə düşərdi ki, axır zamanlar, yəni təqribən 1965-ci illərdə, Mustafa kişinin torpağı qəbul olunmuş normadan çox olduğuna görə, hökumət tərəfindən müsadirə edilərək onun bir hissəsini oğlu Cahangirə, digər hissəsini isə oğlu Məsimə vermişdilər (kənar sakinlərə verilməsin deyə). O vaxtlar həmin ərazidə alma-armud bağları var idi. Həqiqətdə isə yerin adı sənəddə Cahangirin, dadı isə Mustafa kişinin olub. Hətta meyvənin bağının altına tökülənləri belə Mustafa kişi öz oğluna, yəni əsl bağ sahiblərinə xəsis xarakterindən irəli gələn xüsusiyyətlərinə görə verməmişdir.

Kənd camaatının bildiyi kimi açıq etiraf etmək lazımdır ki, Arçut kəndində birinci alma-armud bağı Mutafa kişinin olub (Şərifin Cələsi istisna olmaqla). Elə bu Cələ özü də Mustafa kişinin atası – Əhməd ağaya məxsus olub (el içində Xain Əhməd deyərlərmiş. Yəqin ki, onun da yuxarıda qeyd olunan cəhətləri varmış).

Kənddə 2-ci alma-armud bağı Məhəmməd kişinin olub (Eminov Hüseynin atası). Məhəmməd kişi Mustafa kişinin doğma əmisi olub, amma aralarında bir o qədər çox yaş fərqləri olmayıb (təxminən 5-6 yaş). Məhəmməd kişi bağı əkib-becərməsi çətinliklə əmələ gətirirmiş. O ağaclar yaxşı bitmirmiş. Ola





bilər ki, yerin relyefindən də asılı imiş (torpağın tərkibi məhsuldar olmayıb). Deyilənlərə görə, Məhəmməd kişi həmişə gileylənərmiş ki, a kişi bu uşağa bax (Mustafa kişini nəzərdə tuturmuş) mən onunla bacara bilmirəm, mənim ciddi cəhətlərimə baxmayaraq, onun məhsulu mənimkindən həmişə çox olur.

Kənddə onun arı təsərrüfatı var imiş. Sonradan tayfada bu arıçılığı onun qardaşı oğlu Əhmədə, Əhməddən isə övladları Şərif və Teymur kişiyə keçib. Babalarımızdan ən cavanı olan və arıçılıqla yaxından məğul olan Teymur kişi olub. Hətta, sonradan köçüb getdiyi və məskunlaşdığı Allahverdi rayonunda Mədən kəndində də bu işləri davam elətdirib. Eyni zamanda, Eminov Hüseyn kişi son qaçqınlıq dövrünə qədər də tayfanın arıçlıq ənənələrini davam etdirmişdi...








## Rəcəb kişi haqqında

Rəcəb kişi öz qardaşlarından gec doğulduğu üçün çox kiçik olub. Ona görə də onun söylədikləri tarixi qızı Balaxanım nənə Məmməd müəllimə danışıb. Rəcəb kişi ilə qardaşları arasında olan yaş fərqi, təqribən Emin babanın oğlanları – Talıb əmi ilə Şükrət əmi arasındakı yaş fərqi qədər düşünmək olar. (Təqribən 30-35 yaş).

Rəcəb kişinin 3 oğul və 1 qız övladı olub. Oğlanları Cəlil, Baba və Süleyman, qızı isə Balaxanım olub.

- Cəlilin bir oğlu – Kərim olub və həmin kənddə ailə quraraq, yaşamış (hər biri haqqında şəcərədə ətraflı qeyd olunub) və Eminlərin «Rəcəbov»lar deyilən «qolu» - Kərim kişinin övladları və onun davamçılarıdır.

- Babanın 2 övladı olmuş, bir oğlu Vəli evlənməmiş dünyasını dəyişmiş, digər oğlu İbrahim isə müharibəyə gedib qayıtmamışdır.

- Süleyman 1915-ci ildə türk-erməni qarşıdurmasında erməni xəyanətinin qurbanı olmuşdur.

- Balaxanım nənə isə təqribən 1960-cı illərdə dünyasını dəyişib. Balaxanım nənə öz əmisi oğlu (Nəbi kişinin oğlu) İsmayılla evlənib.



Odur ki, qələmə alınan tarixi faktları, o cümlədən hadisələri Rəcəb kişinin qızı Balaxanım nənənin dedikləri və söylədiklərinə əsaslanaraq yazılmışdır.

İsmayıl kişinin Həbib adlı bir oğlu olub ki, o da 15 yaşında xəstəlikdən vəfat etmişdir. Balaxanım nənədən isə 1 qız övladı olub ki, onun da adı Eminə olub. Eminə isə 2001-ci ildə Bakı şəhərində 91 yaşında dünyasını dəyişib.

Nəhayət, Balaxanım nənənin söylədiklərini və Arçut kəndinin ağsaqqalları olan Əbdürrəhman kişinin (Allah rəhmət eləsin, 120 yaşında rəhmətə gedib) və rəhmətlik Əsəd kişinin (Rəcəb müəllimin atası) söylədiklərini nəzərə alaraq, aşağıda qeyd olunanları, yəni Eminlər tayfasının tarixindən yazırıq.

Rəcəb kişi barəsində söyləyirlər ki, savadı olmamasına baxmayaraq, şifahi xalq folklorunu yaxşı bilirdi. Kənd camaatı uzun qış gecələrində onun evində toplaşarmış, o isə onlara xalq nağıllarından, dastanlarından, quranın təvsirindən, şəriət qanunlarından danışarmış. Kəndin toy məclislərində, yas mərasimlərində ağsaqallıq edərmiş. Hətta kəndə başqa bir yerdən aşıqlar gələndə Rəcəb kişinin evinə gələrmiş, onun xeyir-duasını alandan sonra kənddə çalıb oxuyarlarmış.

Rəcəb kişi bundan əlavə, türkəçarə ilə məşğul olarmış, yəni müalicəvi otları yaxşı tanıyarmış və kənd camaatına bu sahədə də məsləhət verər və köməklik edərmiş.









## Atam Alı kişinin və nənəm Fatmanın Qara Məmməd haqqında xatirələri

- Atamın atası Qara Məmməd Todar dağında məskən salmışdır. Otuz yaşına qədər evlənməmişdir. Gürcüstanın Qaraçöp vilayətindən yaylağa gələrmişlər. O zaman Ermənistan yox idi. Bu yerlər Çar Rusiyasının ixtiyarında idi. Çobanlar yaylaqda bir yerə toplaşıb at çaparmışlar. Məmməd kişi yaxşı güləşirmiş. Anam Fatmanın qardaşları İpəkli yaylağına gələrmişlər. Oyunlarda qalib gələn atam anamı orda da alıb. Hazırda anamın tayfası Gürcüstanın Qaraçöp rayonunda yaşayır.

- O, söyləyirdi ki, hər il Novruz bayramında cavanlar meydana toplaşardılar. Zurna-balabanın səsi altında cavanlar güləşər, oynayar, yallı gedər, rəqs edər, müxtəlif cür istirahət edərdilər.

Qonşu ermənilər də gəlib bu güləşənlərə qoşulur. Bir erməni varmış, yaxşı güləşirmiş. Odur ki, onun dizini yerə qoymaq üçün Qara Məmmədi dağdan çağırırlar. Qara Məmməd çox güclü imiş, ancaq güləş fəndlərini təcrübədən keçirtməmişdi. O, deyir ki, mən yaxşı güləş bilmirəm, amma ermənininin harasısa əlimə keçərsə, aman olmayacaq. Nə isə, özündən razı erməniylə güləşən Qara Məmməd onu başına qaldırıb yerə elə çırpır ki, ermənininin baş-gözü qanayır. Yerdə yarımcan qalan ermənini aparırlar.



Məmməd Emin oğluna Qara Məmməd də deyirdilər. O, ucaboylu bir kişiydi. Atası Eminin qoyun sürüsünü otararmış. Ağqaya deyilən yerdə yataqları vardı. Həmişə yaylaqda olardı. Nənəm Fatmanın dediyinə görə, Qara Məmməd dəmir yolu kənarında qoyun otarırmış, ermənilər qatardan onu daşa tutmuşdu. Başından yaralanaraq bu zədədən dünyasını dəyişib. Bu hadisə 1915-ci ildə olub. 8 övladı (dörd oğlu, dörd qızı varmış) olan Qara Məmməd hamının karına gələrmiş, qonaqpərvərlikdə ad çıxartmışdı.

- Çar Rusiyası Tbilisidən İrəvana dəmir yolu çəkmişdir. Bu dəmir yolu Gürcüstanın Sarvan (Marneuli) rayonundan, Şulaverdən Sadaxlıdan sərhəddindən keçib Ermənistanın Ayrım, Axtalı, Allahverdi, Sanahin, Şahalı, Qaraisi, Sasur və s. keçməli idi. Bu yolun çəkilişində kəndlərdən camaat biyara işləyirdi. Emin ağa həmin yolun kənarında fəhlələr üçün yataq düzəltmiş, onlar üçün dükanlar açmışdı.

Atam danışırdı ki, mən həmin dükanlara satılmaq üçün ərzaq malları, süd, yağ, pendir və s. aparırdım.



## Məmməd müəllimin Əhməd Emin oğlu haqqında xatirələri

Əhməd Emin oğlu sənətkar idi. O, dülgərlik kənd təsərrüfatı alətləri (cüt, kotan, tapan və s.) düzəldən, divar bənnası, həm də heyvan dərisindən yaxşı kürk və başqa geyimlər tikərdi.

Çox arı saxlayardı. Dəmir yolu kənarında böyük bağ salmışdı. Ətrafını hasarlamışdı. Kolxoz qurulanda Sovetlər əlindən aldılar.

Əhmədin paxıllığını çəkənlər də varmış. El içində ona sənətkarlığın az adama öyrətdiyinə görə bəzən Xayın Əhməd də deyərmişlər. Hətta qardaşlarına da bu sənəti öyrətmək istəməyib. Ancaq bacarıqlı imiş, hər iş əlindən gələrmiş, usta sənətkar olub. 100 yaşında dünyasını dəyişib.







## İBRAHİMLİ TAYFASININ SƏNƏTKARLARI VƏ SONRAKI TARİX

İbrahimlə başlayan İbrahimli tayfasından 40-dan yuxarı sənətkar çıxmışdır. Buna misal olaraq Əhməd Emin oğlu haqqında qeyd etmək yerinə düşərdi. Belə ki, Əhməd Emin oğlu sənətkar idi. O, dülgərlik kənd təsərrüfatı alətləri (cüt, kotan, tapan və s.) düzəldən, divar bənnası, həm də heyvan dərisindən yaxşı kürk və başqa geyimlər tikərdi.

Çox arı saxlayardı. Dəmir yolu kənarında böyük bağ salmışdı. Ətrafını hasarlamışdı. Kolxoz qurulanda Sovetlər əlindən aldılar.

Əhmədin paxıllığını çəkənlər də varmış. El içində ona sənətkarlığın az adama öyrətdiyinə görə bəzən Xayın Əhməd də deyərmişlər. Hətta qardaşlarına da bu sənəti öyrətmək istəməyib. Ancaq bacarıqlı imiş, hər iş əlindən gələrmiş, usta sənətkar olub. 100 yaşında dünyasını dəyişib.

Bu nəsil şəcərəsinə diqqətlə baxdıqda aydın olur ki, vaxtilə kənd təsərrüfatı sahəsində çalışan insanlardan varlı-karlı ziyalılar meydana gəlib. Fiziki cəhətdən sağlam olan nəslimizin əqli cəhətdən də böyük uğurları vardır. Nəslimizdə müxtəlif sahələrdə çalışan ali təhsilli mütəxəsislər mövcuddr.

Tayfamızın tarixi haqqında məlumatları toplayan mən, Məmməd Alı oğlu, yaşlı nəslin nümayəndələrindən öyrənib qeydə almışam.

Belə şəxslərdən olan Balaxanım Rəcəb qızının 80-90 yaşı olardı. İkinci belə şəxslərdən olan Əsəd Həsən oğlu idi. O, İbrahimin Türkiyədən necə gəldiyini və Ardıc kəndində necə məskunlaşdığını nəql edərdi. Abdulrəhman Mustafa oğlunun isə yaşı 120-dən yuxarı idi. O, İbrahimli tayfasından olan Qara Məmməd haqında, o cümlədən abidələr və yer adları haqqında geniş biliyə malik idi.

## ARDIC KƏNDİ

Ardıc kəndindən 1,5 km arada yerləşən şosse yolu vardı. Bu yol Yerevan, Leninakan, Qars, Tbilisi, Qazax magistral şosse yoluydu. Onun yaxınlığındakı təpənin başında İbrahimin adı ilə bağlı qəbirstanlıq var idi. Bu qəbirstanlıqda İbrahimin özünün və qohum-əqrabaları dəfn olunmuşdur. Qəbir daşları üstündə adlar, illər yazılışı var idi.

Son vaxtlar İbrahimin törəməsi olan Əli Şərif oğlu öz hesabına qəbirstanlığın ətrafını hasarlamışdır. Hasarın ətrafına ağacların basdırlaması və qəbirstanlığa bulaq çəkilməsi isə İbrahimin törəməsi Məmmədov Məmməd Alı oğlu tərəfindən Lətif İbrahim oğlu Abdullayev ilə birlikdə həyata keçirilmişdir.






İbrahimin nəvəsi Qara Məmmədin Eminin yalı deyilən dağın ətəyində qoyun yatağı var idi. Bu yatağa dağdan bulaq çəkdirmişdir. Bu bulaq Qara bulaq adlanırdı. Kolxoz quruluşu zamanı yatağın daşlarından kolxoza ferma tikilib, Məmməd Alı oğlu (Qara Məmmədin nəvəsi) kəndə həmin bulağı çəkib.

Qeyd: 1988-ci ilin dekabrında erməni millətçiləri azərbaycanlıları Ardıc kəndindən sıxışdırmağa başladılar. Ölümlə üz-üzə duran silahsız əhali öz doğma yurdlarından qaçqın düşməyə məcbur oldu. Əhalinin uzun illərlə tikib-qurduğu evlər, bağçalar, bağlar, təbii sərvətlərimiz, abidələrimiz erməni daşnaqlarına qaldı.

## KEÇMİŞLƏ BAĞLI XATİRƏLƏRİM VƏ TOPONİMLƏR

Keçmişlə bağlı çoxlu xatirələrim var. Bunlar elə toponimləri öyrənmək, adamların həyatını müşahidə etmək, bir də uşaqlıqda gördüyüm gözəl günlər, mənzərələr və hadisələrdi.

Kəndimizin toponimləri (yer adları) yaxşı yadımdadır.

Bunlardan biri elə öz kəndimiz Ardıcdır.



## ARDIC

Ardıc kəndinin yuxarı tərəfi dağlıqdır. Yəni kəndimiz dağın ətəyində yerləşir. Burada Ardıc ağacları bitir. Bu ağaclar alçaq boyludur. İlin bütün fəsillərində yaşıldır. Kəndin adı da ağacların adı ilə adlanır.

## KƏRƏNTÖKÜLƏN

Kərəntökülən buranın sıx meşəliyi olmuş, evləri tikmək üçün ağacları kəsər, oradan da dığırlayarmışlar. Buna görə də Kərəntökülən adlanır. Son vaxtlar meşəliklər kəsilib qurumuşdu. Hazırda oraya süni şam ağacları əkilmişdir.



## POÇTUN CƏLƏSİ

*Poçtun cələsi*
*Almalı*

*Qara Məmmədin cələsi*

*Oyuğun dalı*

*Rəcəbin bulağı*

*Erməninin güneyi*
*Cır-cır bulağı*

və s. yer adları var idi.

Dağlarımızda Kəklikotu, Nanə, Əvəlik, Yemişan, Pişikquyruğu, Göyəm və s. yabanı bitkilər yetişdirilirdi.

## XATİRƏ

Atamgilin var-dövləti çox idi. Qoyun-quzuları, mal-qara naxırları vardı. Qara bulaq deyilən yerdə Eminin yalı ətəyində qoyun-quzu, mal-qara yataqları vardı.

Yaz və payız ayları heyvanları yatağa aparardılar, yay aylarında yaylağa, qışda isə kəndə gətirərdilər. Bu ərazilər atamgilin torpağı idi. Əkin-biçin işlərini orda aparardılar.

Dağın döşündəki bulaqdan yatağa çu çəkmişdilər. Həm özləri istifadə edirdilər, həm də sürü və mal-qara.

Emin əmim əkin-biçin işlərinə baxardı, qoyun-quzuları cavanlar otarardı. Əkin-biçin işləri nökərlər görərdi.

Əmim güneyə pirinc əkdirmişdir.

Yayın son ayı idi. Pirinc biçmə üçün adamları toplayıb aparmışdılar. Atam yaylağa anama ismarlamışdır ki, fəhlələr üçün yemək hazırlayıb göndərsin.

Anam fəhlələr üçün südlü kömbə, qatıq-qaymaq hazırlayıb qablara qoydu, başqa yer-yeməyi və azuqələri də xurcun yığdı.

Mənim o zaman 5-7 yaşım olardı. Mənə tapşırılanları eşşəklə aparırdım. Sən demə, xəbərim olmadan ayran olan tuluğ deşilibmiş, yol boyu ayran xucundan axıb, xəbərim olmayıb.

Əmim mənə dedi ki, niyə gecikmisən? Dimmədim. Oturub çörək yedilər. Susayanlara ayran içmək üçün tuluğu gətirəndə gördülər ki, heç nə qalmayıb.

Əmim üstümə qışqırdı. Üstəlik acıqlanıb bir şapalaq da vurdu.

Atam isə əmimi danlayıb dedi ki, uşağın xətrinə niyə dəyirsən. Ayrandı, dağılıb, qoy cəhənnəmə dağılsın.

Mən o zaman gördüm necə pirinci biçirlər.







## DƏRMAN KİMİ İSTİFADƏ EDİLƏN ÇÖL BİTKİLƏRİ

Bizim dağlarda cürbəcür yabanı bitkilər bitirdi ki, bunlardan əhali həm qida kimi, həm də dərman bitkiləri kimi istifadə edirdilər. Bizim tərəflərdə kəklikotu, qaymaqçiçəyi, qantəpər, birgülü, dəvədabanı, əvəlik, cincilim və s. bitirdi.

Bizim Pəmbək mahalı, o cümlədən Ardıc kəndimiz meyvəli, bağlı-bağatlı gözəl bir yer idi. Əhali burada həm heyvandarlıqla, həm əkinçiliklə, həm də bağçılıqla məşğul olurdular.

O zaman istifadə edilən çəki və ölçü daşları başqa cür idi, məsələn: misqal (100 q), girvənkə (400 q), batman (8 kq), put (16 kq) hesab olunurdu. O zaman bizlərdə qantor çəki tərəzidən istifadə edirdilər.

Məişətdə arşın (1 m), vers (100 m) və s. sahə ölçüləri idi. O zaman qəpik, şahı, abbası, manat, tümən, qızıl, gümüş kimi pul vahidləri istifadə olunurdu.

Bakkal dükanı, dəmirçixana, bazar və həftə bazarı məişətdə vardı və burada satılanlar, alınanlar camaat tərəfindən geniş istifadə olunurdu.

Qoşqu heyvanları öküz, cöngə, at və s-dən ibarət idi. İki və dörd təkərli arabadan istifadə olunurdu.

Məişətdə yaba, kürək, dırmıx və s. işlək alətləri kimi həm geniş istifadə olunur, həm də vacib alətlər hesab olunurdu.



## ERMƏNİSTANDA QALAN QALALARIMIZ

**Koroğlu qalası**

Cəlal oğlu (Stepanavan) mahalında Xram çayının üstündə iki çay qarışığında yerləşir. Bu qalanın xarabalığı hələ də durur.

**Qız qalası**

Bu qala Varansovka çayının, yəni Çubuqludan gələn çayın qırx bulağının qovşağında yerləşir (Cəlal oğlu mahalında)

**Şirin qala**

Bu qala Hallavar dərəsənin başlanğıcında Ley dağının zirvəsində yerləşir. Qalanın daşları üzərində yazılar var, daşın hər birinin çəkisi neçə min tonluq olar. İri hörgülər hələ də durur.

**Gəlin qalası**

Bu qala dağın sıldırım yerində qurulub.

**Narın qala**



## ZİYARƏTGAHLAR

*Hamoyun ocağı*
*Ağa seyidin künbəzi*
*Ağ pir*
*Hacı Xəlil ocağı*
*Əli daş qılınclayan*
*Qotur bulağı*
*Qaltaqçı piri*
*Cır-cır*
*Xıdırelləz*
*Qaraçoban ocağı*
*Qırxbulaq*
*Armud ocağı*
*Arçut məscidi*

## BİR QEYD

Məmməd Məmmədovun xatirələr kitabı haqqında düşünərkən, ağlıma ilk gələn onun yaşının ahıl çağında qeyd etdiyi müdrik fikirləri və dinimiz haqqında qeydlərini bir yerə toplamaq oldu. Onun iki qalın dəftərçədə ara-sıra bu qeydləri də mənim üçün maraqlı idi. Onları kitabda verməyi özümə borc bildim.

İmam Bağır(a) buyurur: «İnsanı küfrə yaxınlaşdıran şeylərdən bir də öz din qardaşları ilə zahirdə dostluq edib, fürsət düşən kimi onu rüsvay etmək üçün səhvlərini bir-birinin ardınca yadda saxlamaqdır» («Cameüs-səadət» cild 2, səh. 279).

İmam Sadiq(ə) buyurur: «İnsanı Allahdan daha çox uzaqlaşdıran hal fürsət düşən kimi rüsvay etmək üçün biri ilə üzdə dostluq edib onun eybini yadda saxlamaqdır» («Üsuli-kafi» cild 2, səh. 355).

Müəllifi məlum olmayan (qeyd edilməyən) bir şeir parçası:

«Quran» buyurub yoldan çıxmaq günahdı,
Körpü salıb su çəkdirmək savabdı.
Ələddin səbr elə, demə nahaqdı,
Bir gün eşidərsən gülə-gülməyə.

Məmməd müəllim erməniləri ifşa edən tarixi faktlarla bərabər onların iç üzünü açıb göstərən şeirləri də qeyd dəftərlərinə qeyd edib.

Azğınlar, azqınlıq edir erməni,
Hər bir cinayətə gedir erməni,
Tarix boyu min bir hiylə işlədib
Məkrli məqsədlər güdür erməni.

İgidlər oylağı Qazax mahalı,
Başından buğ çıxır, dəyişib halı,
Nə varsa millidir, qoruyaq, qardaş!
Sahibsiz qoymayaq yamacı-yalı.

Sonradan bu şeirlərin müəllifinin Ələddin Rövşən oğlu Danaçıyev olduğunu öyrənirəm. O, Gürcüstan Respublikası Ərcivan-Sarvan kəndi, Gürcüstan Jurnalistlər birliyinin üzvüdür.



# KƏND TƏSƏRRÜFATI İLƏ BAĞLI QEYDLƏR

Məmməd Məmmədovun kənd təsərrüfatı ilə bağlı işlədilən alətlərlə əlaqədar qeydləri də maraqlıdır. Onlardan bir neçəsini saxlamaq və kitabda vermək qərarına gəldim.

**SENAJ** – biçilmiş və doğranılmış yaşıl ot kütləsidir. Nəmliyi 40-50 faiz düşənə qədər soluxdurulmaqla hazırlanan konservləşdirilmiş yemdir. Senajı hazırlamaq üçün bitki kütləsi biçildikdən sonra 50-55 faizə qədər soluxdurulmalı və dərhal altı və yanları betonlaşmış xəndəyə basdırılıb kipləşdirildikdən sonra üstü polietilen plyonka ilə örtülüb sonra 20 sm qalınlığında torpaqlanmalıdır. Senajın basdırılması 1-2 günə başa çatmalıdır.



**KÜLƏŞ** – respublikamızın təsərrüfatlarında qaba yemlərin geniş yayılmış növüdür. Qış dövründə tövlə şəraitində saxlanan mal-qaranın yemləndirilməsində doğranmış küləşdən təmiz və yaxud başqa yemlərlə qarışdırılıb istifadə olunur. Küləşin dadını yaxşılaşdırmaq və onun qıcqırmasını nisbətən sürətləndirmək üçün hər ton küləşə 20-30 kq hesabı ilə kəpək, yem və yaxud üyüdülmüş dən yemləri qarışdırlmalıdır.

Basdırılmış küləşin hər bir layı ağır traktorla kipləşdirilir. Doldurulmuş xəndəklərin üstü iki qat polietilenlə örtülərək 15 sm qalınlığında torpaqla örtülməlidir. Yemlərin istifadə səmərəliliyini artırmaq, heyvanlar tərəfindən mənimsənilməsini yaxşılaşdırılmaqla, mal-qara yedizdirilməzdən əvvəl onların hazırlanmasının böyük əhəmiyyəti var.

**SİLOS** – müxtəlif yem bitkilərinin yaşıl kütləsindən şirəli yem hazırlanması üsullarından biri və yemlərin bioloji üsulla konservləşdirilməsidir. Respublikamızın təsərrüfatlarında silos əsasən qarğıdalıdan, günəbaxandan və yabanı otlardan hazırlanır.

Heyvanların tam qiymətli yemlərlə düzgün yemlənməsi onların sağlamlığını qoruyur. Yüksək məhsuldarlıq yaratmaqla onların inkişafına köməklik göstərir. Heyvanların keyfiyyətli tam qiymətli yemlərlə yemləndirlməsi bir çox xəstəliklərin qarşısının alınması üçün böyük rol oynayır. Heyvnalarda xəstəliklərin baş verməsi yem ilə əlaqədardır. Yemlə olan nöqsanlar xəstəlik yarada bilər.

1-ci yemlə bir çox xəstəlik törədiciləri orqanizmə düşə bilər. 2-ci keyfiyyətsiz yemlər mal-qaranın yemləndirilməsi zamanı xəstəliklər əmələ gətirir. 3-cü heyvanlara verilən yem tam keyfiyyətli olmalıdır. Orqanizmin tələbini ödəməyən qida maddələri yemdə olursa xəstəliklər əmələ gəlir. 4-cü mal-qaranın yemlənmə qaydası düzgün olmalıdır, yəni bir gün tez, bir gün gec ola

bilməz. Yemlər tam (qiymətli) keyfiyyətli olmalıdır. Tərikbi vitaminlərlə, minerallarla, sulu karbohidratlarla, mikroelementlərlə zəngin olmalıdır.

Yemlərin təmizliyi və keyfiyyəti mütləq yoxlanılmalıdır. Yem ilə orqanizmə daxil ola bilən xəstəlik törədicilərin profilaktikası hərtərəfli həyata keçirilməlidir. Yemlə qarayaranın, birsilyozun, vərəmin, dabağın, anemiyanın, qızılyel və s. xəstəliklərin törədiciləri orqanizmə daxil ola ilər və həmin xəstəlikləri əmələ gətirə bilər. Bundan əlavə, yem bitkiləri düzgün yığılıb saxlanmalıdır. Əksər təsərrüfatlarda yay dövründə otlaq şəraitində saxlayırlar.



Eminlər tayfasının tarixi barəsində ağsaqqallarımızdan, ağbirçəklərimizdən və kəndimizin yaşlı nəslindən  eşitdiklərimiz haqqında

Məmməd Alı oğlu Məmmədovun həyat kitabçasında olan bəzi şeir və bayatılarında öz əksini tapmışdır





## Oğluyam

Əgər soruşsan kiməm, hardanam?
Pəmbək mahalından, dağlar oğluyam,
Özüm Ardıc köylü, yurddan aralı,
Gözlərim vətənçün ağlar – oğluyam...

Ulu babam Qarsın Çamırlı səmti,
Soy nənəm Qazaxın İşıqlı kəndi,
O vaxtlar zəmanə başqaydı-başqa,
Babam dağlar döşündə salıb bəndi...

Soy-köküm Emin oğlu İbrahimlidi,
Türkiyədən gəlmə, o Qars köyündən,
Varı-halı çox evlərə bəllidi,
Zadəgan əsilli ziyalı soyundan...





## Todar dağı

Durub baxım bu yerlərdən vətənə,
Qoy bağlarım gözlərimə görünsün,
Todar dağı yenə dumanlı-çənli,
Özgə bir dumana-çənə bürünsün!..

Qoy açsın çiçəklər əl-əlvan yenə,
Salamlar çatdırsın bənövşə mənə,
Qoy çaylar bir anlıq axsın tərsinə,
Vətən deyib dizin-dizin sürünsün!..

## Ucalsın

İnsan ol, qədir bil, saxla hörməti,
Dildə-ağızda söhbətin olsun,
Özünə dost topla, şərəflə yaşa,
Öz sözün olsun, şanın ucalsın!..

Pis işlər yaraşmaz təmiz bir ada,
Mənəmlik eləmə fani dünyada.
Bir də bel bağlama xainə, yada,
Özünün həmişə tədbirin olsun!..





# Bayatılar

Eləmi o güneylər?
O dağlar, o güneylər,
Qoy məni xatırlasın,
O dağlar, o güneylər!..

***

Əzizim, əslim-köküm,
Öz soyum, əslim, köküm,
O dağlara bağlanıb,
Mənim də nəslim, köküm!..

***

Əzizinəm, a kəndim,
Mən də biçib-əkəndim,
Qaldı yada-yağıya,
Doğma olan o kəndim!..

***

Əzizim, güllü dağlar,
A duzlu-çöllü dağlar,
Sizdən aralı düşdük,
Ürəyimiz qan ağlar!..

***

Əzizim, o tən deyil,
Hər yer də vətən deyil,
Yaxşılıq elə, qalsın,
Qalandı, itən deyil!..

